QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Sentyabr 2013
07 (1051)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Məmməd Arazın 80 illik yubileyinin keçirilməsi haqqında

### Azərbaycan Respublikası Prezidentinin Sərəncamı



2013-cü ildə Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, xalq şairi, Dövlət mükafatı laureatı Məmməd Arazın (Məmməd İnfil oğlu İbrahimovun) anadan olmasının 80 illiyi tamam olur.

Vətənpərvərlik duyğuları ilə zəngin Məmməd Araz yaradıcılığı Azərbaycan poeziyasının parlaq səhifələrindən birini təşkil edir. Şairin yüksək bədii-fəlsəfi ümumiləşdirmələrlə səciyyələnən, lakonik deyim tərzinə malik dərin ictimai məzmunlu lirikası gücünü vətən təbiətinin gözəlliklərindən, böyük tarixi keçmişimizdən və milli ədəbi fikrin tükənməz xəzinəsindən almışdır. Ana dilinin bütün incəliklərini özündə toplamış bu poetik irs gəncliyin mədəni-mənəvi dəyərlərə ehtiram ruhunda formalaşdırılması baxımından müstəsna əhəmiyyətə malikdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq milli ədəbiyyatın inkişafına mühüm töhfələr vermiş xalq şairi Məmməd Arazın 80 illik yubileyinin keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, xalq şairi Məmməd Arazın 80 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 27 sentyabr 2013-cü il*

## Yeni tədris ili: arzular, qayğılar

### ADPU-da 2013-2014-cü tədris ilinin başlanması münasibətilə tədbir keçirilib

Yeni tədris ilinin başlanması hər bir ali təhsil müəssisəsinin kollektivi kimi, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professor-müəllim heyəti və tələbə kollektivi üçün xoş və əlamətdar bir hadisədir. Qeyd edək ki, 2013-2014-cü tədris ili respublikamızın qabaqcıl ali məktəblərindən biri olan ADPU-nun kollektivi üçün də bir sıra yeniliklərlə başlayıb. Bu barədə ADPU-da sentyabr ayının 16-da 2013-2014-cü tədris ilinin başlanması münasibətilə keçirilən tədbirdə ətraflı məlumat verilmişdir. Tədbirdə universitet rəhbərliyi, professor-müəllim heyəti, tələbələr və kütləvi informasiya vasitələrinin nümayəndələri iştirak etmişlər.

ADPU-da yeni tədris ilinin başlanması münasibətilə keçirilən tədbir Azərbaycanın Dövlət himninin səsləndirilməsi ilə başlandı. Sonra ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov çıxış edərək müəllimləri və tələbələri yeni tədris ilinin başlanması, eləcə də bu il universitetə qəbul olmuş I kurs tələbələrinin valideynlərini övladlarının ali məktəbə qəbul olması münasibətilə təbrik etmiş, tələbələrə təhsildə uğurlar arzulamışdır.

Rektor Yusif Məmmədov öz maraqlı və dolğun çıxışında bildirmişdir ki, xalqımızın böyük oğlu, müstəqil, müasir Azərbaycan dövlətinin banisi və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin strateji dövlətçilik kursunu çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev elm və təhsilə böyük qayğı və diqqət göstərir. Azərbaycan Prezidenti cənab İlham Əliyevin elm və təhsilin inkişafını ölkəmizin davamlı inkişaf strategiyasının prioritet istiqamətlərindən biri elan etməsi bu sahəni yüksək inkişaf yoluna çıxarmışdır.

Rektor Y.Məmmədov ulu öndərimiz Heydər Əliyevin gənclərə xitabən söylədiyi bu müdrik fikri xüsusi vurğulamışdır: “Öyrənmək üçün oxuyun, yaratmaq üçün oxuyun, qəlbinizə, ruhunuza yaxın olanlar uğrunda mübarizə aparmaq üçün oxuyun!”

Rektor Y.Məmmədov eyni zamanda tədbir iştirakçılarının diqqətini müəllim adını, müəllim əməyini çox yüksək qiymətləndirən Ulu Öndərimizin bu müdrik kəlamına yönəltmişdir: “Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər və xüsusi qayğı ilə əhatə olunmalıdırlar. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Bizim hər birimizə bilik verən, təhsil verən, bu səviyyəyə çatdıran məktəbdir, məktəbdə dərs deyən isə müəllimdir. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram”.




Rektor Y.Məmmədov öz çıxışına davam edərək bildirmişdir ki, dövlət başçısı İlham Əliyevin həyata keçirdiyi uğurlu sosial-iqtisadi siyasət nəticəsində ölkəmizin iqtisadi imkanları ilbəil sürətlə artır və bu sürətli, dinamik iqtisadi inkişafa uyğun olaraq elm və təhsilə göstərilən qayğı və diqqət də yüksəlir. Son illər ölkəmizdə təhsillə bağlı 16 inkişafyönümlü dövlət proqramı icra olunur. Bu proqramların uğurla icra olunması milli təhsil sistemimizin sürətlə inkişaf etməsinə, təhsilin keyfiyyətinin yüksəldilməsinə, onun yeni və müasir məzmun kəsb etməsinə, təhsil müəssisələrinin maddi-texniki bazasının gücləndirilməsinə, təhsil sahəsində çalışan şəxslərin maddi-sosial vəziyyətinin yaxşılaşdırılmasına və eyni zamanda təhsil sistemimizin beynəlxalq aləmə inteqrasiyasına əlverişli şərait yaratmışdır.

Azərbaycan Prezidenti cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Dövlət başçısı 2007-ci il sentyabr ayının 4-də “Ən yaxşı ümumtəhsil müəssisəsi” və “Ən yaxşı müəllim” müsabiqələrinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Bu sərəncamlara uyğun olaraq artıq 6 ildir ki, ölkəmizdə “Ən yaxşı müəllim” və “Ən yaxşı ümumtəhsil müəssisəsi” müsabiqələri keçirilir. Ölkə Prezidenti cənab İlham Əliyev hər il “Ən yaxşı müəllim” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 100 nəfər müəllimin 5 min manat məbləğində, eləcə də “Ən yaxşı ümumtəhsil müəssisəsi” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 50 ümumtəhsil müəssisəsinin 10 min manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılmaları haqqında sərəncamlar imzalayır. Bu baxımdan, ölkə Prezidenti cənab İlham Əliyevin bu il avqust ayının 6-da imzaladığı sərəncamlar da təhsil ictimaiyyəti tərəfindən yüksək qiymətləndirilir. Dövlət başçımızın bu sərəncamları cəmiyyətdə müəllim adının, müəllim nüfuzunun yüksəldilməsinə yönəlmiş növbəti vacib bir addımdır və nəticə etibarilə müəllim əməyinin, pedaqoji fəaliyyətin stimullaşdırılmasına xidmət edir.

Eyni zamanda dövlət başçısının bu il avqust ayının 30-da təhsil müəssisələrində çalışan işçilərin əməkhaqlarının sentyabrın 1-dən orta hesabla 10% artırılması haqqında, eləcə də doktorantlara, ali təhsil, orta ixtisas və ilk peşə-ixtisas təhsili müəssisələrinin tələbələrinə və şagirdlərinə verilən təqaüdlərin artırılması haqqında imzaladığı sərəncamlar bu qəbildən olan şəxslərin sosial müdafisəsinin gücləndirilməsi və onlara dövlət qayğısının artırlması kimi xeyirxah bir məqsədə xidmət edir. Bununla yanaşı, ölkə Prezidentinin bu il sentyabr ayının 13-də 2013-2014-cü tədris ilində öz ixtisas qruplarında ən yüksək nəticə ilə ali məktəblərə qəbul olmuş 102 nəfər tələbəyə Prezident təqaüdünün verilməsi haqqında, həmçinin sentyabrın 14-də dövlət büdcəsindən maliyyələləşdirilən təşkilatlarda elmi dərəcəsi olan işçilərin vəzifə maaşlarının elmi dərəcələrə görə sentyabr ayının 1-dən 2 dəfə artırılması haqqında, eləcə də ali məktəb tələbələri üçün Prezident təqaüdünün artıtlması haqqında imzaladığı sərəncamlar da böyük razılıq hissi yaratmışdır.

Hər il olduğu kimi, bu il də ölkəmizdə məktəb tikintisinə və məktəblərin təmirinə xüsusi diqqət yetirilmişdir. Təkcə 2013-cü ilin yay aylarında Bakı şəhərində 46 məktəb əsaslı təmir edilib, ölkə üzrə isə 200-dən çox məktəb təmir edilib. Son 10 ildə Azərbaycanda 2700-dən çox məktəb tikilib və əsaslı təmir edilib,. 90 məktəbdə isə təmir işlərinin aparılması nəzərdə tutulur.

Paralel olaraq təhsil müəssisələrində innovasiyalar, kompyuter və digər müasir informasiya-kommunikasiya texnologiyaları geniş tətbiq edilir. Hazırda ölkəmizdə 20 şagirdə 1 kompyuter düşür, halbuki 2004-cü ildə hər 1063 şagirdə 1 kompyuter düşürdü.

Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri




Mehriban Əliyevanın şəxsi təşəbbüsü və təşkilatçılığı ilə respublikamızın bütün bölgələrində çoxlu sayda yeni və müasir tipli məktəb binaları inşa edilib, təhsil işçilərinin və şagirdlərin istifadəsinə verilir. Həmin məktəblər müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilir, şagirdlərin yüksək səviyyədə təhsil almaları üçün hər cür şərait yaradılır. Mehriban xanım Əliyevanın həyatımızın digər sahələrində olduğu kimi, təhsil, maarifçilik sahəsindəki belə səmərəli fəaliyyəti də xalqımız tərəfindən çox yüksək qiymətləndirilir. Həmçinin Heydər Əliyev Fondunun vitse-prezidenti, Rusiya Azərbaycanlı Gənclər Təşkilatının sədri, İslam Əməkdaşlıq Təşkilatının Gənclər Forumunun baş əlaqələndiricisi Leyla xanım Əliyevanın Azərbaycan həqiqətlərinin, xüsusilə də Xocalı soyqırımı haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün əsl vətəndaş və yüksək milli təəssübkeşlik hissi ilə beynəlxalq miqyasda həyata keçirdiyi səmərəli fəaliyyət hər bir azərbaycanlıda böyük razılıq hissi doğurur. Leyla Əliyevanın təşkilatçılığı ilə keçirilən tədbirlər davamlılığı ilə diqqəti çəkir və beynəl-

(Davamı 3-cü səhifədə)

# Təhsil Naziri Mikayıl Cabbarovun müəllim və tələbələrlə görüşü

***Azərbaycan Respublikasının Təhsil Naziri Mikayıl Cabbarovun 2013-2014-cü tədris ilinin başlanması münasibətilə sentyabr ayının 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professor-müəllim heyəti və tələbə kollektivi ilə keçirdiyi görüş ölkəmizdə pedaqoji kadrların hazırlanmasına verilən yüksək qiymətin ifadəsidir. Həmin görüşdə ADPU-nun müəllim və tələbələri Təhsil Naziri Mikayıl Cabbarovun milli təhsil sistemimiz və bu ali təhsil müəssisəsi barədə düşüncələri ilə tanış oldular.***






ADPU-nun Böyük akt zalında keçirilən görüşü giriş sözü ilə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açmışdır. Rektor Y.Məmmədov Təhsil Naziri Mikayıl Cabbarovu və Təhsil Nazirliyinin nümayəndələrini, müəllim və tələbələri yeni dərs ilinin başlanması münasibəti ilə təbrik etmiş, Təhsil Nazirinin ilk dərs günündə ADPU-ya gəlişini onun müəllim hazırlığına göstərdiyi diqqətin təzahürü kimi qiymətləndirmişdir. Rektor Y.Məmmədov eyni zamanda ulu öndər Heydər Əliyevin həmişə Azərbaycan təhsilinə, Azərbaycan müəlliminə göstərdiyi yüksək diqqət və qayğıdan söz açmış, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi islahatlardan bəhs etmişdir. Göstərmişdir ki, Ümummilli Liderin bünövrəsini qoyduğu və uğurla inkişaf etdirdiyi təhsil siyasəti Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən ölkəmizin davamlı inkişaf strategiyasının prioritet sahələrindən biri elan edilmişdir. Nəticə göz önündədir: Azərbaycanda elm və təhsilin beynəlxalq standartlara cavab verməsi yolunda dönmədən uğurlu iş aparılır və həyata keçirilən islahatlar öz müsbət nəticələrini verməkdədir.

Rektor Y.Məmmədov bu məsələlərdən danışarkən Azərbaycan Prezidenti İlham Əliyevin son illər təhsil sahəsi ilə bağlı imzaladığı sərəncam və fərmanlardan söz açmış, ADPU-nun professor və müəllimlərinin universitetin 85 və 90 illik yubileylərində prezident sərəncamları ilə müxtəlif yüksək dövlət mükafatlarına layiq görülmələrindən qürurla bəhs etmişdir.

Təhsil Naziri Mikayıl Cabbarov öz çıxışında nazirliyin hazırda həyata keçirdiyi və yaxın gələcəkdə həyata keçirməyi nəzərdə tutduğu həllivacib vəzifələrdən danışmışdır.

Dövlət başçısı İlham Əliyevin 2007-ci il sentyabr ayının 4-də "Ən yaxşı ümumtəhsil müəssisəsi" və "Ən yaxşı müəllim" müsabiqələrinin keçirilməsi haqqında imzaladığı sərəncamların müəllimlər arasında və ümumtəhsil məktəblərində doğurduğu yüksək əhval-ruhiyyədən, məhz bu müsabiqələrin nəticəsi olaraq hər il 100 müəllimin 5 min manat, 50 ümumtəhsil müəssisəsinin isə 10 min manat məbləğində birdəfəlik pul mükafatları ilə mükafatlandırılmalarından bəhs etmişdir. Həyata keçirilən bu və digər tədbirlərin respublikada orta təhsilin səviyyəsinin yüksəldilməsində önəmli rolu olduğunu söyləmişdir. Göstərmişdir ki, cənab İlham Əliyevin bu il avqustun 30-da təhsil müəssisələrində çalışan işçilərin əməkhaqlarının sentyabr ayının 1-dən 10%, eləcə də doktorantlara, ali, orta ixtisas və peşə təhsili müəssisələrində təhsil alan tələbə və şagirdlərə verilən təqaüdlərin artırılması haqqında imzaladığı sərəncamlar ölkə əhalisi tərəfindən rəğbətlə qarşılanmışdır.

İlk dərs gününü bayram səviyyəsində dəyərləndirən Təhsil Naziri M.Cabbarovun çıxışında həm də cari dərs ilinə hazırlıq ərəfəsində yeni ümumtəhsil müəssisələrinin inşası, əlavə tədris korpuslarının istifadəyə verilməsi, müəyyən təhsil müəssisələrində aparılan əsaslı və cari təmir işləri ilə bağlı məqamlar da özünə yer almış, bütün bunların ölkədə tam orta təhsilin inkişafındakı önəmli rolu xüsusi qeyd edilmişdir. Göstərmişdir ki, təkcə bu il Bakı şəhərində 164 məktəb binası Təhsil Nazirliyi tərəfindən əsaslı təmir edilmiş, dövlət başçısı istifadəyə verilən bu məktəblərin açılışında iştirak etməklə Azərbaycan təhsilinə, Azərbaycan elminə yüksək dərəcədə önəm verdiyini bir daha göstərmişdir.

Təhsil Naziri M.Cabbarov çıxışında ADPU-nun uğurlu keçmişi və bu günü ilə bağlı məqamlara da xüsusi toxunmuşdur. ADPU-nun Azərbaycan elminə verdiyi töhfələrdən bəhs edərkən nazir Pedaqoji Universitetin məzunlarından Yusif Məmmədəliyev, Zahid Xəlilov və Həsən Abdullayevin AMEA-nın prezidentləri olmaları faktını görüş iştirakçılarının diqqətinə çatdırmaqla ADPU-nun öz məzunları ilə qürur duymağa haqqı olduğunu söyləmişdir. Bildirmişdir ki, təhsilin keyfiyyəti, ilk növbədə, müəllimlərin peşəkarlıq səviyyəsi ilə bağlıdır və onlar bunun üçün öz üzərlərində müntəzəm işləməlidirlər.

Hazırda həm cəmiyyətin, həm də təhsil sisteminin qarşısında duran başlıca vəzifə budur ki, - demişdir Təhsil Naziri, - ali məktəblərin verdiyi təhsilin səviyyəsi yüksəlsin. Bu səviyyə elə bir həddə çatmalıdır ki, Azərbaycan gəncliyi dünyanın tanınmış ali təhsil müəssisələrində deyil, öz respublikamızda ali təhsil almağa üstünlük versin. Biz Təhsil Nazirliyi olaraq respublikanın ali məktəbləri ilə birgə çalışaraq buna nail olacağıq. Bu məqsəd üçün isə dünyanın nüfuzlu ali məktəblərinin uğurlu təcrübələri ilə tanış olub, bu təcrübənin yerli mühitə tətbiqinə nail olmalıyıq. Ali təhsil müəssisələrinin rəhbərləri birgə işləyərək əməkdaşlıq yollarını tapmalıdırlar, dövlət tərəfindən ayrılan sərmayələr daha çox peşəkarlığı ilə diqqətçəkən müəllimlərin gəlir səviyyəsinə öz müsbət təsirini göstərməlidir. Bu istiqamətdə sizinlə optimallaşdırmanın yollarını müəyyənləşdirəcəyik.

Təhsil Naziri M.Cabbarov I kurs tələbələrinə demişdir: "Daha bir neçə il keçəcək, siz ali təhsilinizi başa çatdırıb ümumtəhsil və ali məktəblərdə, həmçinin digər sahələrdə əmək fəaliyyətinə başlayacaqsınız. Siz öz fəaliyyətinizi şagirdlərinizə yalnız bilik verməklə məhdudlaşdırmamalısınız. Siz onlara biliyi necə əldə etməyin yollarını öyrətməli, onları layiqli vətəndaş və vətənpərvərlər kimi tərbiyə etməlisiniz. Ölkəmizin bütün məktəblərində ilk dərs saatlarının vətənpərvərlik mövzusunda keçirilməsi də bu məqsədimizdə qərarlı olduğumuzun göstəricisidir. Gələcəyin müəllimləri olacaq sizlərdən tələb olunan da budur: müəllim adının şərəfini dərk etmək və bu şərəfi qoruyub saxlamaq! Bilməliyik ki, bir çox sahələrdə uğurlar əldə edən ölkələr təbii ehtiyatlara malik olan ölkələr deyil, intellekt potensialı güclü olan ölkələrdir".

Təhsil Naziri M.Cabbarov çıxışının bu yerində demişdir: "Növbəti illərdə tələbələr yalnız biliklərə yiyələnməklə kifayətlənməyəcəklər, onların qarşısında idarəetmə ilə bağlı vəzifələr duracaq. Tələbələr təhsillərini başa çatdırandan sonra daha mükəmməl sistemin iştirakçısı olacaqlar. Bilikləri bölüşmək üçün daha səmərəli sistem qurulacaq, onlar həmin bu sistemi idarəedənlər olacaqlar. Bizim ali məktəblərin gücü yalnız ali təhsil müəssisələrində çalışan professor-müəllim heyətinin gücündən deyil, tələbələrin onlarla birgə və səmərəli əməkdaşlığı üçün yaradılan şəraitin effektliyindən ibarətdir".

Təhsil Naziri M.Cabbarov çıxışında ali məktəblərin muxtariyyətinin daha da genişləndirilməsi istiqamətində mütərəqqi addımlar atılmasının, mövcud qanunvericiliyin verdiyi imkanlardan maksimum istifadə olunmasının zəruriliyini bildirmiş, ali təhsil müəssisələrinin muxtariyyətinin təmin edilməsinin mühüm şərt olduğunu nəzərə çatdırmışdır: "Ali məktəblərin hansı peşələri tədris etməkdə, mükafatlandırma işini müstəqil həyata keçirməkdə öz səlahiyyətləri olmalıdır. Ali təhsil müəssisələrində islahatların keçirilməsində məqsədlərdən biri də budur. Ölkə Prezidenti tərəfindən son 10 ildə Azərbaycanda elm və təhsili yüksək inkişaf yoluna çıxartmaq üçün qətiyyətli addımlar atılmışdır".

Dövlət tərəfindən təhsilin maddi-texniki bazasının gücləndirilməsindən, bu sahəyə sərmayə yatırılması istiqamətində atılmış qətiyyətli addımlardan söz açan nazir yaradılmış şəraitdən səmərəli istifadə edilməsinin qarşısında duran əsas vəzifələrdən biri olduğunu diqqətə çatdırmışdır. "Nazirlik olaraq bizim də ali təhsil müəssisələrinin rəhbərləri ilə vəzifəmiz ondan ibarətdir ki, yatırılan sərmayədən səmərəli istifadə edə bilək"-demişdir. Yeni yaradılmış İnformasiya Texnologiyaları Universitetinin Azərbaycan Diplomatiya Akademiyasının zəngin bazasından bəhrələnərək fəaliyyət göstərməsini buna nümunə göstərmiş, bu cür əməkdaşlığın davam etdirilməsinin vacibliyini bildirmiş, Boloniya prosesinə keçid üçün ardıcıl iş aparılmasını məqsədəuyğun saymışdır. Azərbaycan xalqının, dövlətinin elmə, təhsilə olan münasibətinin ölkəmizdə əlverişli təhsil sistemi qurulmasına imkan verdiyini deyən nazir gələcəkdə də bu istiqamətdə fəaliyyətin dəstəklənəcəyini xüsusi qeyd etmişdir.

***

Sonda Təhsil Naziri M.Cabbarov I kurs tələbələrini maraqlandıran sualları cavablandırmış, bir daha ADPU-nun professor-müəllim heyətini və tələbələri yeni dərs ilinin başlanması münasibətilə təbrik etmişdir.



**Ayətxan İSGƏNDƏROV**

# Yeni tədris ili: arzular, qayğılar

### ADPU-da 2013-2014-cü tədris ilinin başlanması münasibətilə tədbir keçirilib

(Əvvəli 1-ci səhifədə)

xalq miqyasda uğurlar qazanır.

Rektor Y.Məmmədov eyni zamanda qeyd etmişdir ki, yeni tədris ili öz zəngin elmi-pedaqoji potensialına görə respublikamızın qabaqcıl ali təhsil müəssisələrindən biri olan ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi üçün də bir sıra yeniliklərlə başlayır. Rektor Y.Məmmədov rəqəmlərə istinad edərək bildirmişdir ki, bu il ADPU-ya ali təhsilin bakalavriat pilləsində əyani şöbəyə 10 fakültə, 21 ixtisas üzrə 1670 nəfər, qiyabi şöbəyə isə 10 ixtisas üzrə 119 nəfər qəbul edilib. Bütövlükdə builki tədris ilində ADPU-ya 1789 nəfər bakalavr qəbul edilib. Eyni zamanda bu il ADPU-ya ali təhsilin magistratura pilləsində əyani şöbəyə 50 ixtisas, 27 istiqamət üzrə 232 nəfər, qiyabi şöbəyə isə 21 ixtisas, 14 istiqamət üzrə 105 nəfər magistrant qəbul edilib. Ümumilikdə bu il universitetin magistraturasına 337 nəfər daxil olub. Bu il həm də ADPU-nun magistraturasına yeni 2 ixtisas - Dünya ədəbiyyatı və Korreksiyaedici təlim ixtisasları üzrə də tələbə qəbulu həyata keçirilib.

Respublikamızın ali təhsil müəssisələrinin yeni maliyyələşmə mexanizminə keçməsi ilə əlaqədar olaraq bu il ADPU-ya dövlət sifarişi əsasında ali təhsilin bakalavriat pilləsində 663 nəfər qəbul edilmişdir. Cari tədris ilində ADPU-nun magistraturasına isə dövlət sifarişi əsasında 150 nəfər daxil olmuşdur.

Rektor Y.Məmmədov öz çıxışında bu il ölkəmizdə keçiriləcək prezident seçkiləri üzərində xüsusi dayandı: "Məlum olduğu kimi, bu il oktyabr ayının 9-da respublikamızda növbəti prezident seçkiləri keçiriləcəkdir. Buna görə də bu il xalqımız, millətimiz üçün həm əlamətdar, həm də siyasi baxımdan məsuliyyətli bir ildir. Bu il iyun ayının 7-də Yeni Azərbaycan Partiyasının tarixi V qurultayı keçirildi. Ölkəmizin və eləcə də Cənubi Qafqazın ən qüdrətli siyasi partiyası olan, sıralarında 600 mindən çox əqidədaşı birləşdirən YAP özünün bu ali və mötəbər toplantısında rəsmi qaydada yenidən yekdilliklə cənab İlham Əliyevin Prezidentliyə namizədliyini irəli sürdü. Bir faktı da xatırlatmaq istəyirəm ki, buna qədər ölkənin nüfuzlu kütləvi təşkilatları olan Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyası, Respublika Ağsaqqallar Şurası, Azərbaycan Qızıl Aypara Cəmiyyəti, Xaricdə Təhsil Alan və Məzun Olmuş Azərbaycanlı Gənclərin Forumu və Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı öz ali məclislərində cənab İlham Əliyevin Prezidentliyə namizədliyini irəli sürmüşdülər. YAP-ın bu qərarı xalqımızın böyük əksəriyyətinin arzusunu özündə ifadə edir. Əslində, bu, Azərbaycan xalqının mütləq əksəriyyətinin seçimidir. Çünki cənab İlham Əliyevin Azərbaycana rəhbərlik etdiyi 10 il ərzində xalqımız iqtisadi, siyasi, sosial, elm, təhsil, mədəniyyət, idman sahələrində və eləcə də həyatımızın bütün digər sahələrində böyük uğurlar, nailiyyətlər qazanmışdır.

Cənab İlham Əliyevin Azərbaycana rəhbərliyi dövründə ölkəmiz beynəlxalq siyasi münasibətlər sistemində də öz layiqli yerini tutmuşdur. Azərbaycan 2011-ci il oktyabr ayının 24-də 155 ölkənin yüksək etimadı və böyük siyasi dəstəyi ilə dünyanın ən nüfuzlu və mötəbər beynəlxalq qurumu olan Birləşmiş Millətlər Təşkilatının (BMT) Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilmişdir. Bu, Azərbaycanın böyük siyasi-diplomatik uğuru, nailiyyətidir.

Ölkə Prezidentinin həyata keçirdiyi mütərəqqi və praqmatik siyasət nəticəsində Azərbaycanda dövlət-vətəndaş və hakimiyyət-cəmiyyət münasibətləri etibarlı və möhkəm bünövrə üzərində qurulmuşdur. Bir sözlə, cənab İlham Əliyev sözün həqiqi mənasında hər bir Azərbaycan vətəndaşının Prezidentidir.

Bu gündən ölkəmizdə seçki kampaniyasının rəsmi təbliğat-təşviqat mərhələsi başlanır. İnanıram ki, alternativsiz siyasi liderimiz cənab İlham Əliyev bu il oktyabr ayının 9-da ölkəmizdə keçiriləcək prezident seçkilərində xalqımızın çox böyük dəstəyi və etimadı ilə yenə də Azərbaycan Respublikasının Prezidenti seçiləcəkdir. Mən tələbə-gənclərimizi, professor-müəllim heyətini, universitetin əməkdaşlarını prezident seçkilərində cənab İlham Əliyevə səs verməyə çağırıram".

Rektor Y.Məmmədov çıxışının sonunda bir daha müəllim və tələbələri yeni dərs ilinin başlanması münasibətilə təbrik etdi və onlara böyük uğurlar arzuladı.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar BƏXTİYARQIZI**

# Dindirməyin dərdlini, dərd onsuz da dindirir...



Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi, "Şöhrət" ordenli, Prezident təqaüdçüsü, şəxsiyyətinə və mənəviyyatına daim hörmət və məhəbbət bəslədiyim, ustadım və müəllimim Həsən Mirzəyev haqqında düşünəndə gözlərim önündə gözəl qəlbli, sadə, təvazökar, mənən zəngin, layiqli vətəndaş, böyük ictimai-siyasi xadim, görkəmli tədqiqatçı-alim, istedadlı şair obrazı canlanır. Peşəkar dəst-xəttə malik bu görkəmli alimin Azərbaycan dilinin morfologiyası, toponimiyası, folkloru, dialektologiyası ilə bağlı fundamental əsərlərindən qədərincə bəhrələnmişəm, şeir yaradıcılığının pərəstişkarı olmuşam. Professor Həsən Mirzəyevin "Həsən Mirzə" imzası ilə qələmə aldığı poetik örnəklərinin də ilk oxucularından biriyəm. Həsən müəllimin elmi, ictimai-siyasi fəaliyyəti ilə şeir yaradıcılığı vəhdət təşkil edir. Deyirlər ki, Vətən, el-oba dərdindən bu dünyada ağır yük, həsrət yoxdur. İnsanın qəddini əyən, onun daxilində haray qoparan bu dərdin mənəvi yükünü çəkmək nə qədər dəhşətli, facielidir. Bu faciənin mahiyyətini çözələsək, o zaman onun arxasında duran hər iztirabın nə qədər dözülməz olduğunun şahidi olarıq. İnsan doğulduğu, boya-başa çatdığı yerə-yurda elə dərin köklərlə bağlı olur ki, bu zəncirvari bağlantının hansısa halqasını qırıb, ondan uzaqlaşmağa mənəvi gücü, qüvvəsi olmur. Bu yurd, el - oba səni özünə sarı çəkib, soydaşlarının mənəvi-maddi abidəsi olan diyarla bağlayır.

Bəli, bu mənada zahirən sakit görünən, zəhmətsevər, işgüzar, qibtəediləcək yaradıcılıq enerjisinə və ensiklopedik biliyə malik, zamanın ədalətsizliyinə sinə gərən, bu ədalətsizliyi mühakimə edən, qəlbi Vətən dərdləri, kədərləri, yaraları ilə yüklənmiş bu istedadlı qələm sahibinin yazılarında həmişə böyük bir "Dərd" obrazı görmüşəm. H.Mirzə bu obrazı oxucu gözündə o qədər qabardır ki, istər-istəməz oxucu ilə həm özünün daxili "Məni", həm də zaman-zaman erməni faşistləri tərəfindən zəbt edilən, işğala məruz qalan yurd yerlərimiz arasında gözəl bir mənəvi körpü yaradır. Onun poetik örnəklərinin hər misrasında Dərələyəz, Göyçə, Zəngəzur, Qarabağ, Təbriz, Dərbənd kəlmələri var. Bu qədim yurd yerlərimiz onun şeirlərində dil açıb danışır, onları düşmən caynağından azad etməyə çağırır.

İstedadlı qələm sahibi, gözəl tədqiqatçı, ilhamlı şair, filologiya üzrə fəlsəfə doktoru, Azərbaycan Yazıçılar Birliyinin üzvü, "Qızıl qələm" mükafatı laureatı, "İlin ən yaxşı müəllimi" müsabiqəsinin qalibi, Avropa Nəşr Mətbu Evinin qızıl mükafatçısı Mahirə Nağıqızı sayca 12-ci olan bu kitabında da məhz H.Mirzənin "Dərdimi" şeirinin və eyni zamanda bu şeirin təsiri altında ona ünvanlanmış poetik örnəklərin sosial təhlilindən söhbət açır. Bundan bir qədər əvvəl, yəni, 2012 - ci ilin yanvar ayının əvvəllərində M.Nağıqızı "Həsən Mirzəyevin yaradıcılığında filologiya məsələləri" mövzusunda yazdığı dissertasiya işində bütün bu məsələləri qabartmış, bu görkəmli alimin dilçilik fəaliyyətini bütün istiqamətlərdə tədqiq edib, üzə çıxarmışdır. Görünür, dissertasiyanın həcmi imkan vermədiyindən M.Nağıqızı bu arada böyük şəxsiyyətin şeir yaradıcılığına qısa şəkildə nəzər salmağı məqsədə müvafiq bilmişdir. Bu araşdırmasında müəllif bu məsələyə yenidən qayıtmış, H.Mirzənin bütöv şeir yaradıcılığını deyil, təkcə "Dərdimi" şeirini təhlil obyekti kimi götürmüşdür. M.Nağıqızı təhlil boyu təkcə H.Mirzənin "Dərdimi" şeirini saf - çürük etmir, eyni zamanda Zəlimxan Yaqubun, Bəhmən Vətənoğlunun, Səadət Butanın, Alqayıtın, Məstan Günərin, Əli Vəkilin, Musa Urudun, Əli Mirzəyevin, Şamil Dəlidağın, Əvəz Lələdağın, Avtandil Ağbabanın, Pərvanə Zəngəzurlunun, Gülayə Şınıxlının, Sədnik Paşa Pirsultanlının, Şubay Qəmginin, Bilman Qüdrətin, Ələmdar Kəlbəcərlinin, Cığatel İsaqızının, Tahir Rzanın, Alim Dərələyəzlinin, Nazilə Səfərlinin, Aidə Gülzarın, Hacı Ruhinin, Tofiq Göyzəminlinin, Təranə Rəhimlinin, Zöhrə Xəlillinin, Gülarə Azaflının, Əli Dərələyəzlinin, İsa Əsədovun, Əli Əkbərin, Zakir Şəhriyazın, Şəkil Dərələyəzlinin, Aşıq İxtiyarın, Mahirə Nağıyevanın, Şöhrət Əfşarın və başqalarının alim-şairin "Dərdimi" şeirinin təsiri altında yazdıqları poetik örnəklərin sosioloji təhlilini və poetik xüsusiyyətlərini araşdırır.

Kitabda M.Nağıqızının əsas məqsədi Həsən Mirzə poeziyasında "Dərd" mövzusunun ideya-




məzmun xüsusiyyətlərini üzə çıxarmaq və həm də eyni zamanda bu mövzuda şeir yazmış sənətkarların əsərlərinin ictimai spesifikliyini müəyyənləşdirmək olmuşdur. Bizcə, müəllif bu vəzifələrin öhdəsindən layiqincə gəlmiş, çağdaş poeziyamızda bu mövzunun rəng qammalarının elmi-nəzəri izahını doğru-dürüst vermişdir.

Zəhmətkeş alim, gözəl pedaqoq, istedadlı şair M.Nağıqızının bu əsərinin də oxucular tərəfindən rəğbətlə qarşılanacağına, sevilə-sevilə oxunacağına şübhə etmirik.

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

# Biz Azərbaycanımızın sabahına səs verəcəyik!

### *Sentyabr ayının 30-da YAP-ın ADPU Qadınlar Şurasının keçirdiyi iclasda iştirak edən hər kəsi bu amal, bu məqsəd birləşdirmişdi*




Yola saldığımız hər gün bizi oktyabr ayının 9-da keçiriləcək Prezident seçkilərinə daha bir addım yaxınlaşdırır. Toplantıda iştirak edən şəxslərin danışığındakı, davranışındakı qətiyyət düşünməyə əsas verir ki, Prezident seçkilərində artıq hər kəs öz namizədini müəyyənləşdirib. Bu şəxs ulu öndər Heydər Əliyevin müdrik siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevdir.

Cənab İlham Əliyevin 2003-2013-cü illəri əhatə edən Prezidentliyi dövründə həyata keçirilənlərə qısa şəkildə diqqət yetirsək görərik ki:

1.Azərbaycanın iqtisadiyyatı 3 dəfə artmış və dünyanın iqtisadiyyatı inkişaf etmiş 50 dövləti sırasına daxil olmuşdur; 2.Neft strategiyası uğurla davam etdirilmiş, mühüm transmilli enerji layihələri həyata keçirilmiş və ölkəmiz Avropanın enerji təhlükəsizliyinin təmin olunmasında əhəmiyyətli rol oynamağa başlamışdır; 3. Azərbaycan 155 ölkənin dəstəyi ilə BMT Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilərək dünya siyasətinin fəal iştirakçısına çevrilmişdir; 4. Ölkəmizdə 1,3 milyon yeni iş yeri açılmış, yoxsulluğun səviyyəsi 6%-ə, işsizlik 5%-ə endirilmişdir; 5. İlk süni peykini fəzaya çıxarmaqla Azərbaycan kosmosu fəth etmiş ölkələr sırasına daxil olmuşdur; 6. Genişmiqyaslı quruculuq-abadlıq işləri nəticəsində regionların siması əsaslı şəkildə dəyişmiş, müasir standartlara uyğun sosial-iqtisadi infrastruktur yaradılmışdır; 7. Ermənistanın işğalçı siyasəti ifşa olunmuş, Xocalı soyqırımının dünyada tanıdılması istiqamətində mühüm addımlar atılmışdır; 8. Ölkəmizdə vətəndaş cəmiyyəti inkişaf etmiş, milli həmrəylik möhkəmləndirilmiş, Azərbaycan tolerantlıq modeli kimi dünyada nümunəyə çevrilmişdir; 10. Bakı şəhəri qlobal əhəmiyyətli məsələlərin müzakirə olunduğu, mühüm beynəlxalq tədbirlərin keçirildiyi siyasi, iqtisadi, mədəni və idman mərkəzinə çevrilmişdir.

İclası YAP-ın Səbail Rayon Təşkilatı Qadınlar Məclisinin sədri, professor Nübar Muxtarova açmışdır. Professor Nübar Muxtarova son 10 ildə respublikamızın keçdiyi dinamik inkişafdan, ölkəmizin bu illər ərzində qazandığı sosial-iqtisadi uğurlardan söz açmış, zala toplaşmış ADPU-nun tələbə-gənclərini Prezident seçkilərində ən layiqli namizəd cənab İlham Əliyevə səs verməyə çağırmışdır. "Siz gənclər xoşbəxtsiniz ki, əksəriyyətiniz Azərbaycanın XX əsrin sonuncu onilliyində yaşadığı çaxnaşmalı, təlatümlü günləri görməmisiniz. Bu səbəbdən deyirəm: elə namizədə səs verin ki, rahat yaşayıb-işləyə, övladlarınızı sakit böyüdə biləsiniz. Bu şəxs isə bütün Azərbaycan xalqının yaxşı tanıdığı, 10 illik Prezidentlik fəaliyyətini müşahidə etdiyimiz İlham Heydər oğlu Əliyevdir" - demişdir.

Sonra çıxış edən YAP-ın ADPU Qadınlar Şurasının sədri, dosent Laçın Həsənova bildirmişdir ki, hazırda biz Prezident seçkiləri ərəfəsindəyik. Biz bu seçkilərə yüksək əhval-ruhiyyə ilə gedirik.

Dosent L.Həsənova öz çıxışında respublikamızın bugünkü dinamik inkişafının ümummilli lider Heydər Əliyevin və onun ən layiqli davamçısı cənab İlham Əliyevin müdrik və uzaqgörən siyasəti sayəsində gerçəkləşdiyini qeyd etmişdir: "Əgər ölkəmizin sosial-iqtisadi göstəricilərini təhlil etsək görərik ki, son 10 ildə dünyada Azərbaycan kimi inkişaf edən ikinci ölkə yoxdur. Ölkənin iqtisadiyyatı, sənaye potensialı 3 dəfə artmışdır.

Prezident İlham Əliyevin təşəbbüsləri və bilavasitə rəhbərliyi ilə həyata keçirilən proqramlar nəticəsində ölkə iqtisadiyyatının şaxələndirilməsi istiqamətində görülən tədbirlər öz səmərəsini verməkdədir. Beynəlxalq maliyyə qurumları Azərbaycandakı vəziyyəti çox müsbət qiymətləndirirlər. Onlar Azərbaycanda əldə edilmiş nailiyyətləri başqa ölkələr üçün də nümunə kimi təqdim edirlər.

Məlum olduğu kimi, Birləşmiş Millətlər Təşkilatı XXI əsri "Təhsil əsri" elan etmişdir. Son 10 ildə dövlətin təhsil sahəsinə olan yüksək qayğı və diqqətini bu sahədə həyata keçirilən islahatlarla, gənclərimizin dövlətin xətti ilə xarici ölkələrdə təhsil almaları ilə, yeni tikilən məktəblərlə, təhsilə ayrılan xərclərlə ölçə bilərik. Bu xərclər ildən-ilə artır. Son illər ölkədə 2700-dən çox məktəb tikilmiş, yaxud əsaslı təmir edilmişdir. Təkcə bu il yay aylarında Bakıda 76 məktəb əsaslı təmir edilmişdir. Azərbaycan Prezidenti cənab İlham Əliyev çıxışlarından birində demişdir: "Əgər Azərbaycan müharibə vəziyyətində olmasaydı, çox güman ki, təhsil xərcləri birinci yerdə olacaqdı".

Bu gün dünyada mövcud olan ən qabaqcıl təcrübələr Azərbaycanda tətbiq edilir. Azərbaycanda sürətli inkişaf, bütün sahələrdə aydın müşahidə olunan canlanma, sosial məsələlərin həllində ildən-ilə əldə edilən uğurlar xalqımızın maddi rifahının yaxşılaşdırması üçün çox ciddi vasitələrdir.

Bütün dövlət siyasəti, dövlətin strateji hədəfləri ölkəmizin hərtərəfli inkişafına yönəldilib. "Azərbaycan-2020: Gələcəyə Baxış" İnkişaf Konsepsiyası dövlətimizin gələcək inkişaf istiqamətlərini müəyyən etmək baxımından böyük əhəmiyyət kəsb edir.

Xalqımız 2003 və 2008-ci illərdə cənab İlham Əliyevə etimad göstərməklə, əslində ulu öndər Heydər Əliyevin siyasətinə öz dəstəyini vermişdi. İnanıram ki, 2013-cü ilin Prezident seçkilərində də xalqımız Heydər Əliyev siyasətinə inamını bir daha ifadə edəcəkdir.

Mən sizlərin hər birinizi cənab İlham Əliyevə səs verməyə çağırıram".

Daha sonra YAP-ın Səbail Rayon Qadınlar Şurası İdarə heyətinin üzvü, Əməkdar müəllim, Prezidentin fərdi təqaüdçüsü Aliyə Təhmasib, universitet tələbələri adından Riyaziyyat fakültəsinin IV kurs tələbəsi Xanım Yaqubəliyeva çıxış edərək hamını oktyabrın 9-da keçiriləcək Prezident seçkilərində fəal iştirak etməyə, ən layiqli namizədə - İlham Heydər oğlu Əliyevə səs verməyə çağırmışlar.

Tədbir tələbələrin ifasında Azərbaycanımızı tərənnüm edən şeir və nəğmələrlə başa çatmışdır.

**A.İsgəndərov**



# Poetik frazeologiyanın tanınmış tədqiqatçısı



Məlumdur ki, dildə bəzən elə ifadələrlə rastlaşırıq ki, bu ifadələrdəki fikir onu təşkil edən sözlərin hər birinin ayrıca mənası ilə izah olunmur, yalnız bütün tərkib və ya ifadə birlikdə bir məna verir. Azərbaycan dilində belə frazeoloji ifadələr, sabit söz birləşmələri, zərb-məsəllər az deyildir. Belə ifadələri danışıqda, ədəbi dildə




işlətməklə, biz öz nitqimizi daha sərrast, obrazlı, emosional və təsirli etmiş oluruq.

Son dövrlər frazeologiyaya aid yazılmış çoxsaylı məqalə, monoqrafiya və dissertasiyalar göstərir ki, bu sahəyə maraq, diqqət hələ də davam edir və öz aktuallığını itirməmişdir. Elə buna görə də Azərbaycan dilçiliyində frazeologiya sahəsində tədqiqat işləri getdikcə artır, müxtəlif səpgilərdə yeni-yeni əsərlər yazılır. Lakin frazeologiyaya aid çox yazılsa da, həmçinin lüğətlər, kitablar nəşr olunsa da, bütün bunlar hələ frazeologiya ilə bağlı bir sıra problemlərin həlli deyildir. Ona görə də frazeologiyaya aid müxtəlif mövzularda hələ də tədqiqat işləri aparmaq lazım gəlir. Çünki dilçilikdə müstəqil bir şöbə olan frazeologiya öz aktuallığını itirmir, əksinə, ona maraq daha da artmaqdadır.

Yeri gəlmişkən qeyd edim ki, frazeoloji birləşmələr dildə qədim zamanlardan işlənməyə başlasa da, dilçiliyin gənc tədqiqat obyektlərindəndir. Yəni dilin lüğət tərkibində xüsusi lay kimi qiymətləndirilən frazeoloji vahidlər, sabit söz birləşmələri, idiomlar adları ilə tanınan həmin lay çox sonralar dilçiliyin müstəqil frazeologiya şöbəsinin tədqiqat obyekti olmuşdur və dəqiqləşdirəsi olsaq, XX əsrin 40-50-ci illərindən sistemli şəkildə öyrənilməyə başlanmışdır.

Frazeoloji vahidlər həm də üslubi kateqoriya olub, dildə, xüsusən bədii mətnin dilində əvəzsiz obrazlılıq, ifadəlilik, ekspressivlik yaradır. Bu baxımdan Azərbaycan ədəbi-bədii materiallar, xüsusən də Azərbaycan poeziyası elmi tədqiqat üçün zəngin və tükənməz bir xəzinədir. Çünki frazeologizmlərdə dilimizdə mövcud olan xalq müdrikliyi, xalq hikməti, xalqımıza məxsus leksikanın şəhdi-balı özünü qoruyub saxlamışdır.

Məlumdur ki, bədii ədəbiyyatımızın müxtəlif janrlarına aid nümunələrinin dilində işlənən frazeoloji vahidlərin tədqiqinə dair bir çox elmi araşdırmalar aparılmış, maraqlı monoqrafiyalar yazılmışdır. Bunlardan biri də, lap bu yaxınlarda oxuculara nəşr edilib təqdim olunmuş tanınmış dilçi-alim, filologiya üzrə fəlsəfə doktoru, demək olar ki, bütün elmi fəaliyyətini müntəzəm olaraq bu problemə həsr edən Məhərrəm Nüseynovun "Poetik frazeologiya" (Almatı, "Ylağat baspası"-2013) monoqrafiyasını əhatə edən kitablardır.

Bu kitablarda müəllifin başlıca məqsədi xalq dilinin qaynaqlarına söykənərək şairlərimizin, sənətkarlarımızın şeirlərində, poemalarında, onların poetik dilində müşahidə və əks olunan frazeoloji ifadələrin müasir dilçiliyin tələbləri baxımından öyrənilməsidir. Bəri başdan deyim ki, dosent M.Hüseynov bu işin öhdəsindən bacarıqla gəlmişdir, çünki onun özü də həm özündən əvvəlki ənənəni, həm də müasirləri olmuş dilşünasların əldə etdikləri nəticələrə əsaslanaraq tam möhkəm elmi təməl üzərində özünün tam orijinal konsepsiyasından ibarət elmi abidəsini ucaltmağa müvəffəq olmuşdur.

Dünya frazeologiya tədqiqat tarixində əsası fransız dilçisi Ş.Balli tərəfindən qoyulmuş bu elmin ondan 40 il sonra ən böyük davamçısı və bu elmi leksikologiyadan ayırıb müstəqil bir şöbə kimi formalaşdıran rus alimi, akademik V.V. Vinoqradov olmuş və onun frazeologiyaya aid bu konsepsiyası 1950-ci illərdən sonra sürətlə yayılmış və genişlənmişdir.

Bu elm sahəsində türkoloqların xidmətləri də xüsusi qeyd edilməlidir. Məsələn, mənə məlumdur ki, elə adını çəkdiyimiz akademik V.V.Vinoqradovla yanaşı, bu sahədə ilk dəfə sistemli iş aparanlardan biri də qazax dilçisi S.K.Kenesbayev olmuşdur. Bu sırada mühüm əsərlər yaratmış türkoloqlardan L.N.Dolqanovun, S.İ.-Raxmatullayevin, İ.F.Seyfullinin, Q.X.Axatovun, S.M.Muratovun, S.T.Nauruzbayevanın adlarını xatırlatmaq, bizcə, yerinə düşər.

Onu da fərəhlə qeyd edək ki, Azərbaycan dilçiliyində də frazeologiyanın özünəməxsus tədqiqat tarixi var. Araşdırmalar göstərir ki, bu sahədə bizim dilçilik elmi çoxlarını qabaqlamış, hələ XIX əsrdə - 1846-cı ildə Mirzə Kazımbəyin çap etdirdiyi qrammatika kitabında bir çox frazeoloji birləşmələrdən, məsələn, "qəm yemək", "vücuda gəlmək", "qüssə yemək" qəbildən frazeoloji vahidlər öz əksini tapmışdır. XIX əsrin sonları, XX əsrin əvvəllərində yazıb-yaratmış görkəmli Azərbaycan yazıçı və alimi Y.V.Çəmənzəminli tərtib etdiyi "Dilimizdə ikimənalı söz və cümlələr" adlı lüğətdə (təəssüf ki, bu lüğət hələ çap olunmayıbdır) Azərbaycan dilindən 140-dan çox frazeoloji vahidi qələmə almış və qısa şərhini vermişdir. Məsələn: hava buludludur - yəni məclisdə şübhəli adam var, saqqal altından keçmək - səthi və zahiri hörmət göstərmək, qulaq asmaq - özünü qanmazlığa vurmaq, nəyisə gizlicə eşitmək istəyi, qarını suya qoymaq - yemək ümidi ilə gözləmək, acgözlülük və s.

Azərbaycan dilçiliyində frazeologiyanın növləri, xüsusiyyətləri və mənbələri haqqında ilk məlumatı Muxtar Hüseynzadə vermişdir. Ondan sonra bu sahə haqqında S.Səfərov ətraflı bəhs etmişdir. O, idiomları, ibarələri, hikmətli sözləri, atalar sözləri və zərbi-məsəlləri, tapmacaları frazeologiyaya aid etmişdir.

Azərbaycan dili frazeologiyasına aid ayrıca əsər yazan dilçi alimlərimizdən N.Rəhimzadənin, K.Əliyevin, H.Bayramovun, A.Qurbanovun, H.Həsənovun, M.Mirzəliyevanın, H.Baxşıyevin adlarını çəkə bilərik. Azərbaycanın məşhur alimlərindən Ə.Dəmirçizadənin, Ə.Orucovun, Z.Əlizadənin, A.Axundovun, T.Hacıyevin, Y.Seyidovun, B.Əhmədovun, T.Əfəndiyevanın, N.Xudiyevin, A.Babayevin, İ.Məmmədovun əsərlərində və məqalələrində frazeologiyanın bəzi məsələləri öz əksini tapmışdır.

Müxtəlif bədii əsərlərin dilinin frazeologiyasına aid tədqiqat aparmış dilçi alimlərmizdən M.Adilov, Q.Kazımov, R.Məhərrəmova, S.Murtuzayev, M.Məmmədov, S.Mehdiyeva, A.Məmmədli və başqaları frazeologiyanın bir çox problemlərinin həllində müəyyən xidmətlər göstərmişlər.

Bütün bunları ona görə xatırlatdım ki, həm müasir oxucuların təsəvvürləri genişlənsin, həm də bu mənzərə fonunda Məhərrəm Hüseynovun da bu sahədə xidmətlərini xüsusi olaraq göstərə bilək.

Hüseynov Məhərrəm Abbasəli oğlu 1945-ci il fevral ayının 18-də Qərbi Azərbaycanın Göyçə mahalının Çənbərək bölgəsinin Şorca kəndində anadan olmuşdur. 1960-cı ildə Şorca kənd 7 illik, 1964-cü ildə isə Ardanış kənd 11 illik məktəbini bitirmişdir. 1964-1969-cu illərdə Azərbaycan Dövlət Universitetinin Filologiya fakültəsində ali təhsil almışdır.

1969-1971-ci illərdə baş leytenant hərbi rütbəsi ilə Sovet Ordusunda motoatıcı rota komandiri kimi qulluq etmişdir. 1971-1975-ci illərdə Göyçə mahalının Ardanış və Ağbulaq orta məktəblərində müəllim işləmişdir. 1975-1989-cu illərdə İrəvan Dövlət Pedaqoji İnstitutunda baş müəllim və dosent kimi fəaliyyət göstərmişdir. 1989-2001-ci illərdə Azərbaycan Texniki Universitetində pedaqoji fəaliyyətini davam etdirmişdir. Bu illər ərzində Bakı Özəl Türk Liseyində, Anadolu Türk Liseyində, "Araz" hazırlıq kurslarında, müəllimləri təkmilləşdirmə və ixtisasdəyişmə kurslarında da dərs demişdir. 2001-ci ildən Azərbaycan Dövlət Pedaqoji Universitetində dosent və Filologiya fakültəsinin dekan müavini vəzifəsində işləyir.

1982-ci ildə AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunda "Mirzə İbrahimovun romanlarının dili və üslubu" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. Filologiya elmləri doktoru elmi dərəcəsi almaq üçün təqdim olunmuş "Azərbaycan poeziyasının dil və üslub problemləri (1960-1980-ci illər)" mövzusunda dissertasiya müdafiəyə buraxılmışdır. Əsərləri Türkiyə, Rusiya, Ukrayna, Qazaxıstan və Ermənistanda nəşr olunmuşdur.

100-dən artıq elmi məqalənin, 10 kitabın müəllifidir. Əsas monoqrafiyaları aşağıdakılardır: "Yazıçının dili və üslubu". 1981, Yerevan, 103 s.; "Romanın üslub zənginliyi". Bakı, 1990, 159 s.; "Şeirşünaslıqda dil sənətkarlığı". Bakı, 2007, 240 s.; "Dil və poeziya". Bakı, 2008, 434 s.; "Poeziya dilinin milli qaynaqları". Bakı, 2009, 292 s.; "Sözün poetikası". Bakı, 2010, 368 s.; "Səsin poeziyası". Bakı, 2010, 318 s.; "Zaman, janr və ədəbi qəhrəman (İsa Hüseynovun hekayələri)". Bakı, 2012, 160 s. və s. Bu gün əlimizdə olan kitabı isə "Poetik frazeologiya" ("Almatı", 2013, 171 səh.) əsəridir ki, onun doktorluq dissertasiyasını əhatə edir. Bütün bunlardan da göründüyü kimi, dosent Məhərrəm Hüseynov bütün elmi fəaliyyətini dilçiliyin bu mühüm sahəsinə səmərəli şəkildə həsr etməkdədir.

Almatıda nəşr olunmuş "Poetik frazeologiya" kitabının elmi redaktoru filologiya elmləri doktoru, professor Baltaday Ebdigaziulu, rəyçilər isə filologiya elmləri doktoru, professor Çinar Aulbekova və filologiya elmləri namizədi Hesen Eliyevdir. Kitaba Abay adına Qazaxıstan Dövlət Universitetinin Dünya dilləri kafedrasının müdiri, filologiya elmləri doktoru, akademik K.İ.Mirzəyev "Frazeologiya və bədii dil sənətkarlığı" başlığında məzmunlu ön söz yazmışdır. Müəllif doğru olaraq yazır: "Azərbaycan poeziyasının zəngin yaradıcılıq təcrübəsinə istinadən M.Hüseynov frazeoloji vasitələrdən obrazlılığın qidalandığı mənbə kimi onun estetik hüdudlarını müəyyənləşdirir, bədiilik imkanları, poetik və obrazlı məna rəngərinin zənginliyi haqqında geniş təsəvvür formalaşdırır. Bütün hallarda frazeologizmlər poetik obrazlılıq sferasında götürülmüş, onların gerçəkliyi canlandırma meyarları müəyyənləşdirilmiş, ümumxalq frazeoloji tərkiblərin məhdudiyyət bilməyən üslubi imkanlarından tutarlı arqumentlərlə danışılmış, estetik fəallığının mühüm səciyyəvi xüsusiyyətləri aşkarlanmışdır."

Tədqiqatçı-alim M.Hüseynov düzgün müəyyənləşdirmişdir ki, frazeoloji birləşmələrin "şeir mətnində özünəməxsus zəngin bədii həyatı var. Mühüm estetik ünsür kimi, poetik mətni təşkil edən ilkin dil materiallarından biri kimi frazeoloji vahidlər adi danışıq, məişət-ünsiyyət funksiyasından fərqli olaraq özündə, daxili semantikasında gözlənilməz əsrarəngizliklər gizlədir. Ondakı potensial imkanlar söz sənətkarlarının qələmindən misralara süzüldükcə açılır."

Bütün bunları o, həssas tədqiqatçı duyğusu ilə poetikliyin vacib məziyyəti kimi, ayrı-ayrı sənətkarların konkret yaradıcılığına müraciət edərək ortaya gətirmiş, izah etmiş və dilçilik elminin müasir inkişaf səviyyəsində qiymətləndirmiş, bir sıra məqamlarda isə onu daha da irəli aparmışdır.

**Tərlan NOVRUZOV,**
**Dünya ədəbiyyatı kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim,**

**Afaq NƏZƏRLİ,**
**Filologiya üzrə fəlsəfə doktoru**

**(Davamı gələn sayımızda)**

# Uğurlarımız davam edir




Məlum olduğu kimi, Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyinin təşkilatçılığı ilə bu il sentyabr ayının 23-25-də Bakı şəhərində ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş III Bakı Beynəlxalq Kitab Sərgi-Yarmarkası keçirilmişdir. Məlumat üçün onu da qeyd edək ki, III Bakı Beynəlxalq Kitab Sərgi-Yarmarkasında 25 dövlətdən 150-dən çox xarici və yerli naşirlər iştirak etmişlər.

Sərgi-yarmarkanın keçirildiyi günlərdə şəhər ictimaiyyəti və qonaqlar, xüsusilə kitabsevərlər sərgi ilə yaxından tanış olmuş və bir çox müəlliflərin əsərlərini əldə etmişlər. Sərgidə elmin müasir tələbləri ilə səsləşən olduqca maraqlı kitab, metodik vəsait və dərsliklər nümayiş etdirilmişdir.

Qeyd edək ki, bu sərgi-yarmarkada Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) üçün xüsusi pavilyon ayrılmışdır. Həmin pavilyonda ADPU-nun professor-müəllim heyətinin son 3 ildə nəşr etdirdikləri 170-dən çox dərslik və dərs vəsaitləri nümayiş etdirilmişdir. Razılıq hissi ilə deyə bilərik ki, universitetin professor-müəllim heyətinin ərsəyə gətirdikləri əsərlər böyük rəğbətlə qarşılanmışdır. Eyni zamanda sərgidə ADPU-nun 90 illik yubileyi münasibətilə nəşr olunmuş "Professor-müəllim heyətinin 1921-2011-ci illərdə nəşr etdirdikləri əsərlərin beşcildlik biblioqrafiya"sı böyük əks-səda doğurmuş, sərgidə iştirak edən mütəxəssis və alimlər tərəfindən yüksək qiymətləndirilmişdir. Sərgidə nümayiş etdirilən "Pedaqoji Universitetin Xəbərləri" də diqqət mərkəzində olmuş və maraqla qarşılanmışdır. Həmçinin ADPU-nun nəşriyyatında çap olunmuş müxtəlif səpgili ədəbiyyatlar da maraqla qarşılanmış, bu ədəbiyyatların olduqca nəfis və oxunaqlı olması haqqında xeyli maraqlı fikirlər söylənilmişdir.

Onu da xüsusi qeyd edək ki, sərgidə uğurla iştirakımıza görə ADPU diploma təltif olunmuşdur. Bu işdə xüsusi əməyi olan Müşfiq Hacıyevə, Nüşabə Əmirəliyevaya, Sevda Daşdəmirovaya, Əsmər Rəsulovaya, Gülsarə Qəhrəmanovaya, Amalya Həmzəyevaya, Aytən Əlizadəyə və Türkan Qasımovaya öz minnətdarlığımı bildirirəm.

**Azər Hüseynov,**
**Elmi kitabxananın direktoru,**
**Əməkdar mədəniyyət işçisi**

# Xəttatlıq milli mədəniyyətimizin mühüm dəyərlərindəndir

**"Peşənin yaxşısı, pisi yoxdur, peşə sahibinin yaxşısı, pisi var. Dünyada 40 mindən çox peşə qeydə alınıb. Sələflərimizin fikrincə, bu peşələr arasında ikisi daha şərəflidir. Bunlardan birincisi həkimlikdir, bəşəriyyət öz sağlamlığını həkimlərə etibar edib. İkincisi isə müəllimlikdir, bəşəriyyət öz gələcəyini müəllimlərə etibar edib. Hər hansı kənd, yaxud şəhərə, bir idarə və ya müəssisəyə yolum düşəndə, keçmiş tələbələrimdən birisinin mənə yaxınlaşıb salam verəndə və lazım olanda həta əlimdən tutub pilləkənləri qalxmağa köməklik göstərmək istəmələri məndə qürur doğurur, şərəf və ləyaqətimi yüksəldir, yaşamaq, yazmaq və yaratmaq həvəsimi bir qədər də artırır".**

**Bu sətirlərin müəllifi ibtidai sinif müəllimliyindən SSRİ PEA-nın müxbir üzvlüyünə qədər şərəfli bir yol keçən ADPU-nun Ümumi pedaqogika kafedrasının müdiri, professor Hüseyn Əhmədovdur. Hüseyn müəllimin xəttatlıq sənəti ilə bağlı məqaləsini təqdim edirik.**

Əvvəllər bizim ənənəvi məktəb və mədrəsələrdə təhsilalanlar özünün yazısı ilə fərqlənirdi. Onların yazıları - xətləri çox zərif və gözəl olurdu. Yaddan çıxarmaq lazım deyil ki, "yazı elmin yarısıdır" meyarı bütün dövrlərdə ziyalılarımızın təhsil səviyyəsini müəyyən edən meyar olmuşdur. Bu gün də bu meyar öz əhəmiyyətini saxlayır və gələcəkdə də saxlayacaqdır.

Son illər tələbələrimizin yazılarını nəzərdən keçirərkən bir qüsurun da şahidi oluruq. Bu, onların dəstxətti ilə bağlıdır.

Azərbaycanın xalqının dünya mədəniyyətinə ən gözəl nümunələr vermiş sənət növlərindən biri də xəttatlıqdır. Tarixi mənbələrə görə, xəttatlığın bir neçə növü olmuşdur: nəsx, nəstəliq, şikəstə, təliq və sulis xətləri, klassik xətlər. Qədim zamanlardan ustad sənətkarlarımızın yaratdığı zərif xəttatlıq nümunələri (miniatürlərimiz və xalçalarımız kimi) bu gün də dünya muzeylərinin qiymətli eksponatları olaraq qorunur. Yazılı mənbələrə görə, Azərbaycan xəttatlığının tarixi Mübarək şah Zərrinqələm Təbrizinin işlərindən başlanır. Mübarək şah Zərrinqələm klassik xətlərin altısını da yaxşı bilirdi və onun həmin xətlərlə yazan xeyli ardıcılları vardı.

O dövrdə xeyli məşhur olan bu böyük xəttatın ardıcıllarından biri də Cəfər Təbrizi idi. Mənşəcə Azərbaycan türklərindən olan Cəfər Təbrizi XV əsrin ən görkəmli xəttatlarından sayılırdı. O, usta xəttat kimi Xorasan və Türküstanda böyük şöhrət qazanmış "Şəkəri-qələm" ləqəbini almış Mir Abdullahın şagirdlərindən idi. Azərbaycanın böyük xəttatlarından biri olmaq-la yanaşı, həm nəstəliq, təliq və süls xətləri ilə, həm də klassik xətlərdə yazmağı bacaran onlarla məşhur xəttatın müəllimi olub. Ustadlardan mənimsədiyi biliklərdən başqa, Cəfər Təbrizinin adı bu sənət sahəsinə töhfə etdiyi bir sıra yeniliklərlə xatırlanır. Cəfər Təbrizinin həyatı Orta Asiyanın Teymur tərəfindən istilası dövrünə təsadüf edir. Onun həyat və yaradıcılıq fəaliyyətindən bəhs edən məlumatda "Vikipediya" yazır ki, Təbrizdə Cəfər Təbrizi Teymurun oğlu Miranşahın sarayında fəaliyyət göstərib. Müəyyən müddət sonra isə o da bir sıra digər usta, rəssam və xəttatlarla birlikdə Herata, Teymurun digər oğlu Şahruxun yanında çalışmağa gəlir. Görkəmli xəttat burada Şahruxun oğlu Baysunqurun yanında işləməklə, kiçik bir kitabxana-emalatxanaya rəhbərlik edib. "Yazı elmin yarısıdır" meyarına əməl edən Cəfər Təbrizi 40-a yaxın xəttatla əlyazmaların üzünü köçürməklə məşğul olurdu. Bundan əlavə emalatxanada miniatürçülər, qızıl suyu ilə işləyənlər, dəri aşılanması və bəzədilməsi üzrə ustalar, bərpaçı və cilçilər də vardı ki, təbrizli ustalardan Aini Təbrizi, İbrahim Təbrizi, Xoca Əli Müsəvvir və başqaları onların arasında idilər. Məşhur xəttat Cəfər Təbrizi özünü qabiliyyətli müəllim və təşkilatçı kimi göstərir və həmin kitabxananın inkişafı üçün çox iş görür.

Cəfər Təbrizi iki məşhur xətt növünü - nəsx və təliq xətlərini sintez edərək nəstəliq xəttini əmələ gətirmişdi. Bu xətt növünü bəzən "İslam xətlərinin gəlini" də adlandırırdılar. Nəstəliq, təliq və sulis xətləri ilə yazmağı bacaran onlarca məşhur xəttatın müəllimi olan Cəfər Təbrizi nəstəliq xəttinin inkişafı üçün o qədər böyük işlər görmüşdü ki, onu bu xəttin ikinci ustadı (müxtəre us-sani) adlandırırdılar.

Herat ustaları sonralar xəttatlığın "Herati" adlanan xüsusi növünü yaratmışdılar. Həmin Herati xətt növünün yaradıcısı isə Cəfər Təbrizi sayılırdı.

Ustad Cəfər Təbrizi Şahzadə Baysunqurun sarayında yaşadığı dövrdə xəttatlıq tariximizdə yaxşı məlum olan bir sıra kitabların - Firdovsinin "Şah-namə"sinin (1430), Sədinin "Gülüstan"ının (1427), Nizami Gəncəvinin "Xəm-sə"sinin (1431) üzünü köçürmüşdür. Bunlar Cəfər Təbrizinin nəstəliq xətti ilə üzünü köçürdüyü kamil xəttatlıq nümunələrindən sayılır. Bu nüsxələr Parisin, Dublinin, Tehranının, İstanbulun, Sankt-Peterburqun məşhur kitabxana və muzey-lərində saxlanılır.

Dahi sənətkar 1480-ci ildə (65 yaşında) Herat şəhərində dünyasını dəyişib.

Ümumiyyətlə, Şərq ölkələrində bütövlükdə xəttatlıq sənəti o cümlədən, gözəl yazı yazanlar, qələm sahibləri həmişə böyük hörmətə layiq olublar. Yazıları, əsərləri dünya muzeylərinin bəzəyinə çevrilmiş görkəmli xəttatlardan biri də Qəzvində anadan olmuş Mir İmdad Qəzvinidir (1553-1615). Mənşəcə azərbaycanlı olan xəttat Mir İmdad XVII əsrin ən yaxşı xəttatlarından biri sayılırdı. Ona "İmdad-ül-mülk", yəni "Dövlətin dayağı" adı verilmişdi. Xalq arasında "Mir İmdad" deyə çağrılan xəttatın əsl adı Mir Məhəmməd bin Hüseyn Həsani Qəzvini idi. Uşaqlıq illəri Təbrizdə keçmişdi. Xəttatlıqda nəstəliq xəttinin mahir ustadı Mövlana Məhəmməd Hüseyn Təbrizidən bu sənətin incəliklərini öyrənmişdi. Mir İmdad Məhəmməd Hüseynin ən sevimli şagirdlərindən idi. Ölümünə az qalmış Mir İmdaddan xahiş edir ki, qələmin mədhinə həsr edilmiş şeirlərini təlimat şəklində tərtib etsin. Həmin şeiri olduğu kimi oxuculara təqdim edirik:

Bəşərin ən gözəl irsi qələmdir,  
bu incə mətləbi unutma!  
Kainat qələmin sayəsində  
şan və şərəfə çatıb,  
Əgər qələm olmasaydı,  
kainat da olmazdı.  
Kim qələmdən  
fayda götürməyibsə,  
onu böyük ağıl sahibi sayma!

Qələm möcüzəkardır, qələm canverəndir, qələm bələdçidir, qələm sarvandır.

Hər həvəskar qələmin qədrini bilməz, onun qiymətini yalnız xəttatlar anlar!

Xəttatlıq sənətinə xüsusi fikir verən M.Şahtaxtlı 1882-ci ildə yazdığı məqalələrindən birində deyirdi: "Gözəl yazmaq incəsənətini mənimsəyin. Bu, varlıları bəzəyir, kasıbları isə dolandırır". O zamanlar məktəbdarın - müəllimin gözəl xətti olması onlar üçün reklam rolunu oynayırdı. M.F.Axundzadənin Şəkidən təhsil dalınca Gəncə şəhərinə - gözəl xətti olan M.Ş.Vazehin məktəbinə gəlməsi də bununla bağlı olmuşdur.

Şagirdlərə yazı nümunələrini öyrətmək işinə R.Əfəndiyevin xüsusi əhə-miyyət verdiyi də məlumdur. O, "Bəsirətül-ətfal" adlı dərsliyində uşaqlara yazı nümunələrinə, yazının nəsr və nəzm növlərinə - məktub təbrikinə, dəvətnamə, təziyətnamə (başsağlığı) yazmaq qaydasına aid nümunələr, izahlar və şərhlər verməkdə onların dəst-xəttinin gözəl olmasına çalışmışdır.

Ümumiyyətlə, qədimlərdə gözəl yazmaq işinə xüsusi diqqət verilirdi. Qori seminariyasının məzunlarından olan professor Ə.Seyidovun yazılarının dəfələrlə şahidi olmuşam. Onun hərfləri muncuq kimi səliqə və sahmanla kağız üzərinə düzməsi - yazması bizləri valeh edərdi.

Fikrimcə, bugünkü məktəblilərə hüsnxətt, yazı nümunələri öyrətməyə diqqəti artırmaq yerinə düşər.



# A.S.Makarenkonun 125 illiyinə həsr olunmuş seminar

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ümumi pedaqogika kafedrasında böyük pedaqoq, istedadlı yazıçı Anton Semyonoviç Makarenkonun 125 illik yubileyi münasibətilə elmi seminar keçirilmişdir. Seminarda Ümumi pedaqogika kafedrasının müdiri, akademik Hüseyn Əhmədov "A.S.Makarenko və Azərbaycan", Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov "A.S.Makarenkonun tanınmış tədqiqatçısı M.Muradxanov", professor, professor Ramiz Əliyev "A.S.Makarenkonun psixoloji ideyaları", pedaqogika üzrə elmlər doktoru Müseyib İlyasov "A.S.Makarenkonun pedaqoji ideyalarında peşəyönümü problemi", professor İramin İsayev "A.S.Makarenko ailə tərbiyəsi haqqında" mövzularında məruzələr etmişlər.

Elmi seminarı ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev açmışdır. O, böyük pedaqoq, istedadlı yazıçı A.S.Makarenkonun (1888-1939) anadan olmasının 125 illiyinin qeyd edilməsinin mühüm hadisə olduğunu bildirmiş, bu novator alimin pedaqoji irsinin müasir dövrümüzdə də aktual və faydalı olduğunu vurğulamışdır.

Ümumi pedaqogika kafedrasının müdiri, akademik H.Əhmədov "A.S.Makarenko və Azərbaycan" mövzusunda məruzəsində bu böyük alimin anadan olmasının 125 illiyi əlaqədar Moskva şəhərində elmi-pedaqoji konfransların və digər müxtəlif tədbirlərin keçirildiyini söyləyib. Onun çıxışından məlum olub ki, pedaqogika tarixinə yeni insan tərbiyəçisi kimi daxil olan Anton Semyonoviç Makarenko Ukraynanın indiki Sumı vilayətinin Belepolye şəhərində fəhlə ailəsində anadan olmuşdur. A.S.Makarenko həm də ədəbiyyat aləmində yazıçı kimi tanınır. Onun bədii əsərləri ilk növbədə, "Pedaqoji poema", "30-cu ilin marşı" və "Valideynlər üçün kitab" adlı publisistik əsərləri insan tərbiyəsi nəzəriyyəsinin yaranmasına və inkişafına xidmət etmişdir. Keçən əsrin ortalarından başlayaraq A.S.Makarenkonun əsərləri dünyanın bir çox xalqlarının dillərinə tərcümə edilmişdir. A.S.Makarenko F.E.Dzerjinski adına kommunaya rəhbərliyi dövründə kommunarlarla birlikdə Azərbaycana gəlmişdir. A.S.Makarenko və onun kommunarları Bakıda olarkən neftçilərlə, fəhlələrlə və şəhər əhalisilə bir sıra görüşlər keçirmişlər. Belə görüşlərdən biri də Bakının qədim olan Bibiheybət neft mədənindən olmuşdur. A.S.Makarenko bakılılarla görüşlərini "Ən yaxşı saatlar" kimi dəyərləndirmiş, kommunarların bu yürüşünü özünün "30-cu illərin marşı" adlı əsərində təsvir etmişdir. A.S.Makarenko özündən sonra böyük bir irs qoyub getmişdir. Onun həyatı və fəaliyyəti ölümündən sonra, xüsusilə 1939-1941-ci illərdən başlayaraq sistemli olaraq öyrənilməyə başlanılmışdır.

Professor F.Rüstəmov məruzəsində bildirmişdir ki, A.S.Makarenkonun pedaqoji irsini respublikamızda təbliğ etmək işi ilk növbədə M.Muradxanova aiddir. M.Muradxanovun "Azərbaycan məktəbi" jurnalında "A.S.Makarenkonun pedaqoji irsində perspektiv xətlər sistemi və ondan istifadə etmək yolları", "A.S.Makarenko intizam tərbiyəsi rejiminin rolu haqqında", "A.S.Makarenko: tərbiyə müəssisələrində əmək tərbiyəsi", "A.S.Makarenko uşaq oyunları haqqında" kimi irihəcmli məqalələri dərc edilmişdir. Müəllif bu əsərlərində unudulmaz pedaqoqun pedaqoji irsini o dərəcədə dərindən təhlil və şərh etmişdir ki, oxucular bu əsərlərdən A.S.Makarenkonun çoxşaxəli pedaqoji irsini hərtərəfli öyrənmək imkanındadırlar. Çıxışının sonunda professor F.Rüstəmov "Mərdan müəllimin muasirləri olan bizlər hələ sağlığında onu "Azərbaycanın Makarenkosu" adlandırmışdıq" - dedi.

Pedaqogika üzrə elmlər doktoru M.İlyasov "A.S.Makarenkonun pedaqoji ideyalarında peşəyönümü problemi" mövzusunda etdiyi məruzədə peşəseçmə probleminin A.S.Makarenkonun pedaqoji yaradıcılığından və fəaliyyətindən qırmızı xətlə keçdiyini bildirdi. Qeyd etdi ki, A.S.Makarenko "Pedaqoji poema" və "Qüllələr üzərində bayraqlar" adlı irihəcmli əsərləri ilə bərabər valideynlər qarşısında etdiyi məruzələrində və radio ilə etdiyi çıxışlarında peşəseçmə məsələsinin mühüm bir problem olduğunu, bu işdə böyüklərin, xüsusən valideynlərin yardımına ciddi ehtiyac olduğunu xüsusi qeyd etmişdir. Tərbiyəçilər və valideyn-lər uşaqların marağını, bacarıq və qabiliyyətlərini öyrənməli, bu spesifik cəhətlərinə müvafiq olaraq onlara məsləhətlər verməli, kömək göstərməlidirlər. A.S.Makarenkonun bu ideyası peşəyönümü probleminin həllinin müasir konsepsiyaları ilə səsləşir. Onun bu sahədəki ideyaları bu günümüz üçün də dəyərlidir.

Professor İ.İsayev isə məruzəsində açıqladı ki, A.S.Makarenko 40 yaşına qədər subay olmuş, sonra koloniyada öz tərbiyəçisi ilə evlənmiş, lakin övladı olmamışdır. Məruzəçi övladı olmayan bir insanın uşaq tərbiyəsi məsələlərinə belə ciddi əhəmiyyət verməsinin səbəbləri üzərində dayandı. A.S.Makarenkonun "Ata-analar üçün kitab" əsərinə istinadən uşaqların ailə tərbiyəsində müşahidə olunan qüsurlarının əsas səbəblərini: ata-ana münasibətlərinin düzgün qurulmaması, ailədə rejimin, ata-ana nüfuzunun olmaması, ailədə uşağın tək olması kimi halların tərbiyə şəraitini çətinləşdirdiyini göstərdi. A.S.Makarenkoya istinadən belə ziddiyyətlərin başvermə səbəblərinin araşdırılmasını və onun vaxtında aradan qaldırılmasını ailə tərbiyəsi işində olduqca vacib şərt kimi dəyərləndirdi.

Professor İ.İsayev A.S.Makarenkonun tərbiyə işində ailə və məktəbin vəzifələri, onun yerinə yetrilməsində birgə əməkdaşlığın, vahidliyin gözlənilməsi, ailədə uşaqların mənəvi-siyasi tərbiyəsi, əmək və peşəyönümü, əməyin tərbiyəyə böyük təsiredici qüvvə olduğu, uşaqların gələcək həyata insan və vətəndaş kimi hazırlanmaları və s. problemlərlə bağlı fikirlərini ümumiləşdirərək seminar iştirakçılarına çatdırdı.

Sonda akademik H.Əhmədov tədbirə yekun vuraraq görkəmli pedaqoq A.S.Makarenkonun pedaqogika tarixində görkəmli yeri olduğunu, bu gün də onun pedaqoji irsindən istifadə edildiyini söylədi, məruzələrdə toxunulan məsələlərə öz münasibətini bildirdi.



**Aynurə Quliyeva,
Ümumi pedaqogika kafedrasının əməkdaşı**

# Riyazi fəaliyyətdə məsafədən təlim texnologiyalarından istifadə zəruridir



Hazırda riyaziyyatın məsafədən təlimi təkcə ali məktəblərdə deyil, ümumtəhsil məktəblərində də öyrənmə prosesinin təşkilinin mühüm forması olmuşdur. Təlim sistemində belə formanın tələb olunmasına çoxlu sayda səbəblər göstərmək olar:

Birincisi, şagirdlərin müstəqil işini və onların özünü təlimi məsələsini həyata keçirmək üçün təhsilalma prosesində onlara İnformasiya-Kommunikasiya Texnologiyalarından (İKT) istifadə etmək vərdişləri aşılanmalıdır;

İkincisi, insanın orta təhsil illərində uyğun texniki və metodik təminatla riyaziyyatın məsafədən təlimindən istifadə etmələri onların riyazi hazırlıq səviyyəsini yüksəldir və onlarda yaradıcılıq vərdişlərinin, fəal təlim-idrak fəaliyyətinin formalaşmasına səbəb olur;

Üçüncüsü, məktəbdə riyaziyyatın məsafədən təlimdən və ənənəvi təlim metodlarından komplek istifadə təlimin tətbiqi (riyaziyyatın texnikaya, iqtisadiyyata və qonşu elmlərə; peşə fəaliyyətlərinə) və praktik (şagirdlərdə riyazi xarakterli müstəqil fəaliyyət formalaşdırmaq) istiqamətlərinin gücləndirilməsinə və keyfiyyətcə yeni səviyyədə fərdi yanaşmanı reallaşdırmağa şərait yaratmağa kömək edir.

Bir sıra elmi-tədqiqatlarda ali məktəbəqədər hazırlıq mərhələsində riyaziyyatın məsafədən təlim sisteminin qurulmasında aşağıdakı tələblərin gözlənilməsi lazım bilinir: a) belə təlimin səmərəli olması; b) təlimi sürətləndirmək və tənzimləməyin mümkün olması; c) təlimin keyfiyyət səviyyəsi dinamikasının müəyyənləşdirilməsi; d) təlimin kompleks fərdiləşdirilməsinin olması (həm şagirdlər, həm də müəllimlər tərəfindən); e) şagirdlərin səhvləri və müvəffəqiyyətlə həll etdikləri məsələlər haqqında statistik məlumat əsasında tədris proqramlarında düzəliş.

Riyaziyyatın məsafədən təlim şəraitində öyrənilməsinin digər tədris fənlərilə müqayisədə əsas fərqi - təlim prosesini riyazi fəaliyyətin quruluşunu və tədris kursunun müvafiq mərhələlərini əks etdirməklə qurmaqdan ibarətdir.

Elmi-metodik ədəbiyyatda riyazi fəaliyyətə müxtəlif yanaşmalarla qarşılaşırıq: bəziləri, məsələn, A.A.Stolyar və başqaları riyazi fəaliyyəti aşağıdakı sxem üzrə yaranan fikir hesab edirlər: idrakın emprik metodlarının köməyi ilə emprik materialın riyaziləşdirilməsi (şərhi), toplanmış riyazi materiallın məntiqi təşkili; riyazi və fənlərarası əlaqə xarakterli məsələlərin həllinə riyazi nəzəriyyələrin tətbiqi.

Bəziləri isə, məsələn, T.A.İvanova və digərləri riyaziyyatda idrakın qnoseloji prosesini əks etdirən və aşağıdakı mərhələlərdən ibarət olan riyazi fəaliyyət modelini (ümumi elmi empik və riyaziyyatın xüsusi metodlarının köməyi ilə faktlar toplamaq, hipotetik-deduktiv metodların tətbiqilə hipotez irəli sürmək; deduktiv metodlara əsaslanan isbatların köməyi ilə fərziyyənin doğruluğunu yoxlamaq; aksiomatik yanaşma əsasında nəzəriyyə qurmaq; riyazi modelləşdirmənin köməyi ilə nəzəriyyəni praktikada yoxlamaq) təklif edirlər.

A.N.Kolmoqorova görə isə təlim prosesi məktəblilərin yaradıcı fikirlərlə təması ilə baş verməlidir və bununla əlaqədar idrakın əsas metodu elmi tədqiqatın təqlidi - yamsılanması olmalıdır.

Bir çoxları kimi biz də bu əsaslı fikrin tərəfdarıyıq. Çünki şagirdlərə bilikləri tapmağı bacarmağı öyrətmək təlimin əsas məqsədidir. Bu məqsədə uyğun olaraq ənənəvi təlim sistemində şagirdlərin yeni bilik qazanmaqda tədqiqatcı olmalarını xüsusi vurğulamaq lazımdır. Bundan əlavə, psixoloji tədqiqatlar göstərir ki, riyazi fəaliyyət təfəkkür səviyyəsi ilə, beləliklə isə təlim materialının mənimsənilməsi səviyyəsilə əlaqədardır. Bunun isə riyazi fəaliyyətin təşkilində nəzərə alınması zəruridir.

Riyazi təlim fəaliyyətinin təşkilinin mühüm formalarından biri məsələlərin sistemləşdirilməsi və onların həlli priyomlarının təsnifatı ilə kəsilməz əlaqədə olan məsələ həlli ilə əlaqədar fəaliyyətdir.

Riyaziyyatın sistemli fəaliyyət əsasında öyrənilməsi ilə birbaşa əlaqədar olan məsələlərin sistemli qurulması ilə bərabər onların həlli priyomları sistemini də şagirdlərə öyrətmək lazımdır.

O.B.Epişeva qeyd edir ki, "Məsələ vasitəsilə təlimi vahid şəkildə birləşdirsək və təlim prosesində konkret mövzular üzrə reallaşdırsaq, onda nüvəsi təlimin məzmunu və metodu vasitəsi və öyrənilən material üzrə şagirdlərin riyaziyyatın öyrənilməsi üzrə təlim fəaliyyətinin təşkilindən ibarət məsələlər sistemi olan, eləcə də onun öyrənilməsinin konkret metodikası alınır."

Məsafədən təlim texnologiyalarının tətbiqilə riyaziyyatın təlimi prosesinin intensivləşdirilməsi şagirdlərin riyazi fəaliyyətinə nəzarəti yerinə yetirir və İKT vasitələrindən maksimum istifadə ilə təlim prosesində yüksək nəticə verir. İKT vasitələrindən istifadə təlim prosesində yeni didaktik tələblərin: uyğunlaşma, təlimdə interaktivlik, öyrənənlərin zehni potensialının inkişafı, təlim materialının quruluş-funksional əlaqəli və sistemli verilməsi, tamlığın və təlimin didaktik dövriyyəsinin kəsilməzliyi, habelə bəzi ənənəvi didaktik tələbləri yeni fikirlərlə tamamlamağa, məsələn, İKT-nin öyrənilən obyekt və ya proseslər haqqında təlim informasiyalarının kompyuter vizuallaşmasından və öyrənilən obyektlər, onların münasibəti, hadisələr, real, habelə virtual baş verən proseslərin kompyuter modelləşdirmələrindən ibarət İKT vasitələrinin hesabına təlimdə əyanilik tələbi daha yüksək səviyyədə yerinə yetirilə bilməsinə imkan verir. Bundan başqa, riyaziyyatın təlimi prosesində riyazi obyektlərin və funksiyaların qrafiklərini, eləcə də öyrənilən qanunauyğunluqların dinamikasını göstərən diaqramları ekranda, habelə dinamik şəkildə göstərməyi təmin edən xüsusi proqram məhsullarından istifadə; həndəsi obyektlərin və onların dinamik təqdimatının ekran təsviri yaratmaq; məlumat-axtarış fəaliyyəti hesablanmalarını avtomatlaşdırma müxtəlif yeni metodik və pedaqoji məqsədlərin reallaşdırılmasına imkan verir. İKT-nin tətbiqi ilə riyaziyyatın təlimində bütün dünyada qəbul edilmiş dinamik konstruktor vasitələrindən istifadə xüsusilə faydalıdır.

Həndəsi çertyojların və ya funksiyaların qrafiklərinin yazı taxtasında və ya kağız vərəqində ənənəvi təsvirindən fərqli olaraq belə vasitələrdə qurulması, yaradılması olduqca əhəmiyyətlidir.

Bu, təkcə qurmaların nəticələrini deyil, habelə onların ilk verilənlərini, alqoritmini və obyektlər arasındakı asılılıqları saxlayan modeldir. Bundan əlavə, belə modelin qurulması prosesi daha faydalıdır. Çünki əvvəlcə belə modelin elementləri arasında düzgün məntiqi asılılıq qurmaq lazımdır. Belə asılılıq düzgün tapılmamışdırsa, onda modelin dinamik dəyişdirilməsi zamanı ya o işləməyəcək, ya da sadəcə tərkib hissələrinə "ayrılaraq" dağılacaq. Dinamik konstruktor vasitələri modellərin müxtəlif növlərini, o cümlədən nümayiş, tədqiqat üçün dəqiqlik tələb edən əl işlərində mürəkkəb üsullar modeli, qurmaların və ya cavabların yoxlanması ilə bağlı tapşırıqları, scenar təqdimat və məşqləri reallaşdırmağa imkan verir.

Yuxarıda deyilənləri yekunlaşdıraraq aşağıdakı məqamları təsdiq etmək olar:

Məsafədən təlim texnologiyalarının tətbiq etməklə riyaziyyatın tədrisi prosesində riyazi fəaliyyətin quruluşunu və riyazi elementlərlə məzmunlu işin mərhələlərini əks etdirmək lazımdır.

Riyazi təlim fəaliyyətinin quruluşunda toplanmış riyazi materialın məntiqi təşkilinin mərhələləri və riyazi hökmlərin, teoremlərin və metodların məsələlərin həllinə tətbiqini ayırmaq lazımdır.

Məsələlər sistemini hazırlamağın ümumi metodoloji əsası-riyaziyyatın təliminə sistemli-fəaliyyətli yanaşma və anlama prinsipidir.

Riyazi məsələlər sisteminə təlimin məzmunu, metodu, vasitəsi və şagirdlərin təlim fəaliyyətinin təşkilinin əsas forması kimi baxmaq lazımdır.

Konkret tədris materialının öyrənilməsi üçün məsələlərin sistemləşdirilməsinin metodik əsası şagirdlərin təlim hərəkətinin formalaşdırılması priyomlarıdır, riyazi metodlar və məsələlər həllinin priyomları; təlim fəaliyyətinin təkmilləşdirilməsində və riyaziyyatın təlimi prosesində alət kimi müasir İKT-nin imkanlarını nəzərə alan metodik yanaşmadır.

Şagirdlərin təlim fəaliyyətinin təkmilləşdirilməsində və riyaziyyatın təlimi prosesində tədqiqat aləti kimi müasir İKT-nin imkanlarını nəzərə alınmasının reallaşdırılmasını cəbrin, həndəsənin, cəbr və analizin başlanğıcının profil məsafədən təlim kursları əsasında reallaşdırmaq olar. Məsələn, planimetriya kursunun qurulmasında metodik ideya olaraq "fiqurların həndəsəsinə", başqa sözlə, planimetriyanın əsas fiqurlarına, onların xassələrinə, onlarda əsas xətlərin və nöqtələrin xassələrinə baxmaq; interaktiv konstraktiv vastələrdə yaradılmış parametrlərin dəyişməsilə riyazi modellərin araşdırılması əsasında planimetriya fiqurlarının xassələrinin öyrənilməsi. Eyni qayda ilə fəza fiqurlarının xassələrini öyrənmək olar.

Planimetriyadan məsələlərin həlli prosesini mərhələlərə belə ayırmaq olar :

1) Məsələ şərtinin təhlili;
2) Lazımi nəzəri materialın təkrarının təşkili;
3) Dayaq məsələləri həllinin priyomlarını xatırlamaq;
4) Dinamik model vasitəsilə planimetriya fiqurları sahəsinin asılı olduğu elementlərin nümayiş etdirilməsi.

**Əsab QULİYEV,**
**Riyaziyyat və onun tədrisi metodikası kafedrasının dosenti,**
**Əməkdar müəllim**

# Əmrulla Xanməd oğlu Paşayev



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. Tanınmış pedaqoq-alim, ADPU-nun Ümumi pedaqogika kafedrasının professoru, pedaqogika üzrə elmlər doktoru, Gürcüstan Təhsil Elmləri Akademiyasının həqiqi üzvü, Əməkdar müəllim Əmrulla Xanməd oğlu Paşayev bu il iyul ayının 29-da 76 yaşında vəfat etmişdir.

Əmrulla Paşayev 1937-ci il noyabr ayının 2-də Qax rayonunun Qarabaldır kəndində anadan olmuşdur. 1953-cü ildə yeddiillik kənd məktəbini bitirmiş, orta təhsilini Zaqatala rayonunun Bəhmənli kəndində başa çatdırmışdır. 1956-1959-cu illərdə orduda xidmət etmiş, ordudan tərxis olunduqdan sonra mexanizator kimi əmək fəaliyyətinə başlamışdır.

1963-1967-ci illərdə Tbilisi Dövlət Pedaqoji İnstitutunun Pedaqoji fakültəsində təhsil almış, həmin fakültəni fərqlənmə diplomu ilə bitirmişdir. 1967-1968-ci illərdə Gürcüstan Dövlət Radio və Televiziya Verilişləri Komitəsində çalışmışdır.

1968-ci ildən A.S.Puşkin adına Tbilisi Dövlət Pedaqoji İnstitutunda Azərbaycan dili və ədəbiyyatı və erməni dili və ədəbiyyatı kafedrasında baş laborant işləməklə yanaşı, pedaqogika və pedaqogika tarixi fənlərindən mühazirə və seminar məşğələləri aparmışdır.

1974-cü ildə professor V.V.Qaquanın rəhbərliyi ilə "XIX əsr-XX əsrin əvvəllərində Gürcüstanda rus-Azərbaycan məktəblərinin meydana gəlməsi və inkişafı" mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş, işlədiyi ali məktəbin Pedaqogika kafedrasında əvvəlcə müəllim, sonra isə dosent kimi fəaliyyətini davam etdirmişdir.

1993-cü ildə "XIX əsr-XX əsrin əvvəllərində Qafqazda ibtidai təhsilin inkişafı" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Elmi-pedaqoji fəaliyyəti 1993-cü ildən ADPU ilə bağlı olmuşdur. 1997-ci ildən professordur.

Müxtəlif illərdə Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunda və ADPU-da fəaliyyət göstərən ixtisaslaşdırılmış Müdafiə Şurasının üzvü, həmin Şuranın nəzdində elmi seminarın sədri olmuş, elmi-pedaqoji kadrların hazırlanmasında fəal iştirak etmişdir.

Gürcüstan Təhsil Akademiyasının həqiqi üzvü seçilən Əmrulla Paşayev pedaqogikanın aktual problemləri, yeni texnologiyalarla bağlı respublika və beynəlxalq miqyaslı elmi-praktik konfranslarda maraqlı və məzmunlu çıxışları ilə fərqlənmişdir. Pedaqogikanın nəzəri və tarixi problemlərinə aid 100-ə qədər məqalənin, monoqrafiya və dərs vəsaitinin müəllifidir.

Professor Əmrulla Paşayevin xidmətləri dövlətimiz tərəfindən layiqincə qiymətləndirilmiş, o, "Əmək rəşadətinə görə" və "Tərəqqi" medalları ilə təltif olunmuş, respublikanın "Əməkdar müəllim"i fəxri adına layiq görülmüşdür.

Səmimi və xeyirxah insan, peşəkar müəllim, məhsuldar alim, ləyaqətli ailə başçısı olan professor Əmrulla Paşayevin əziz xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

Allah rəhmət eləsin!

**ADPU-nun kollektivi**

# Feliks Həmid oğlu Əfəndiyev



Azərbacan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. Nəcib və xeyirxah insan, istedadlı pedaqoq, təcrübəli təhsil işçisi, ADPU-nun Cəbr və həndəsə kafedrasının dosenti Feliks Həmid oğlu Əfəndiyev bu il avqust ayının 29-da vəfat etmişdir.

Feliks Əfəndiyev 1940-cı il iyun ayının 28-də Bakı şəhərində anadan olmuşdur. 1947-ci ildə 164 nömrəli orta məktəbə getmiş, 1958-ci ildə 151 nömrəli orta məktəbi bitirmişdir. 1958-1963-cü illərdə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nun) Fizika-riyaziyyat fakültəsində ali təhsil almışdır.

1963-cü ildə Sumqayıt şəhərində əvvəlcə 11 nömrəli, sonra isə 3 nömrəli orta məktəbdə riyaziyyat müəllimi işləmişdir. 1963-1965-ci illərdə orduda xidmət etmişdir. 1965-1966-cı illərdə APİ-nin Cəbr və həndəsə kafedrasında baş laborant, 1966-1969-cu illərdə həmin kafedrada müəllim, 1969-cu ildən isə baş müəllim işləmişdir. 1989-cu ildə Cəbr və həndəsə kafedrasının dosenti vəzifəsinə seçilmişdir.

Feliks Əfəndiyev funksiyalar nəzəriyyəsi sahəsində bir sıra elmi nəticələrə nail olmuşdur. Feliks Əfəndiyev uğurlu elmi-pedaqoji fəaliyyətinə görə SSRİ Təhsil Nazirliyinin fəxri diplomu, həmçinin respublika Təhsil Nazirliyinin fəxri fərmanları və ADPU-nun fəxri fərmanı ilə təltif edilmişdir.

Amansız ölüm Feliks Əfəndiyevi aramızdan apardı. Feliks müəllimin əziz xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

Allah rəhmət eləsin!

**ADPU-nun kollektivi**

*Tələbələrimiz yazırlar*

# Əziz Nesinin poeziyası haqqında düşüncələr



Həqiqi poeziya özündə bir çox keyfiyyətləri əks etdirir. Bütün bu keyfiyyətlər bir-birini tamamladıqda poeziya bütöv olur. İnsan isə bu bütövün içində itib-batır və humanizmə doğru bir addım atır. Daxilində bir fərəh hissi duyur və dünyanı yenidən dərk etməyə çalışır. Bütün bunlar şeirin və şeiriyyətin möcüzəsidir. Nədir şeir? Sadəcə, dərdləri nəzmə çəkməkmi? İnsanın üzündə bir anlıq belə olsa, təəssürat yaratmaqmı? Yoxsa, ancaq qafiyə düzməkmi?

Böyük Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Füzuli hələ XVI əsrdə deyirdi ki, elmsiz şeir bünövrəsiz divara bənzəyir. Bünövrəsiz divar isə etibarsız olur. Füzuliyə görə, şeir Uca Tanrıya qovuşub, ilahi sevgiyə çatmaq məqamıdır. Digər tərəfdən isə, şeir Allahla mənəvi söhbətdir. Ədəbiyyatda şeirlər saysız-hesabsızdır. Amma hər yazılan şeir, hər şeir yazan da şairdirmi?! Xalqımızın böyük ədibi, görkəmli mütəfəkkiri Cəlil Məmmədquluzadə deyirdi ki, hər şeyi satın almaq olar, şairlikdən başqa. Yəni hər kəs şair ola bilməz. Həyatda, sənətdə uca olan məqamlardan biri də şairlik məqamıdır. Ona görə də *"Öncə peyğəmbərlər, sonra şairlər gəldi"* - deyən dahi Nizami Gəncəvi haqlıdır. Bu uca məqama çox insan yetişmişdir. Belə şəxsiyyətlərdən biri də Türkiyə ədəbiyyatının görkəmli nümayəndəsi Əziz Nesindir. Əsl adı Məhməd Nüsrətdir.

İstedadlı və məşhur yazıçı Əziz Nesin XX əsrdə yaşayıb-yaratmışdır. O, 1915-ci il dekabr ayının 20-də İstanbulda anadan olub. Ə.Nesinin yaradıcılığı ilə Azərbaycan oxucusunun tanışlığı ötən əsrin 60-cı illərinə təsadüf edir. Ə.Nesin daha çox hekayələr və romanlar müəllifi kimi tanınır. Dahi yazarın "Vətən borcu", "Sərt adam", "Sizin ölkədə eşşək yoxdurmu?", "Oğru bu idimi?" "Uçuruma yuvarlanırıq", "Kor döyüşü", "Biz evə qəzet almırıq" kimi hekəyələri, "Qol kralı Səid Hopsəid" romanı və epistolyar (məktub) üslubda yazılmış "Taxtalıköydən məktublar" adlı silsilə əsərləri oxuculara yaxşı tanışdır. Bununla yanaşı, onun xeyli sayda şeirləri də vardır. Onun yaradıcılıq istedadı nəsrdə güclü olduğu kimi, nəzmdə də güclüdür. Ə. Nesinin nəsr əsərləri tədqiq edilib, öyrənilsə də, poeziyası çox da tədqiq edilməmişdir. Ə.Nesinin pozeiyasına dair ilkin araşdırmalardan birini də ADPU-nun "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının elmi işçisi Bəhram Məmmədov aparmışdır. B.Məmmədov "Əziz Nesin həm də şair idi" adlı məqaləsini çap etdirməklə Ə.Nesinin poeziya yaradıcılığına diqqəti çəkmişdir. O, haqlı olaraq yazırdı ki, *"Ədibin şeir yaradıcılığı, poeziya aləmi Azərbaycan məkanında geniş təbliğ olunmamışdır. Halbuki onun dərin ictimai-siyasi, eyni zamanda məhəbbət mövzusunda yazılmış bir-birindən gözəl şeir kitabları vardır".* B.Məmmədov bu məqaləsində Ə.Nesinin şeirlərini təhlil edib, onun zəngin poeziyasının incə məqamlarına toxunmuşdur.

Onu da qeyd edək ki, Ə.Nesin həm satirik yazıçı, həm də satirik şair idi. Buna görə də bəzən Ə.-Nesini "Türkiyənin Sabiri" də adlandırırlar. Çünki o, müxtəlif illərdə yazdığı satirik şeirləri ilə Türk ədəbiyyatını XX əsrdə yüksək bir mərhələyə qaldırdı. Türkiyədə bu qüdrətli qələm sahibinin bütün şeirləri toplanaraq "Əziznamə" adı ilə ayrıca kitab şəklində çap edilmişdir. Bütövlükdə isə onun Türkiyədə 110 kitabı çap olunmuşdur. Poeziyasını bəzəyən, üzdə satirik görünən şeirlərin daxilinə nüfuz etdikdə görürük ki, burada başqa bir dünya var. Onun poeziyasında mövzu istiqamətləri müxtəlifdir. Amma daha çox ictimai-siyasi, fəlsəfi və romantik mövzular aparıcı yer tutur. O, "Yoldaşım badam ağacı", "Ölümə əyilmək", "Bağışla", "Özümə öyüd", "Məktəb", "Son istək" və başqa bu kimi bənzərsiz şeirlərin müəllifidir.

Ə.Nesin yazdığı əsərləri ilə çöhrəmizdə təbəssüm və gülüş yaratsa da, özü daxili iztirablardan, ağrılardan qurtula bilmirdi. Şair ona yaxın olan insanların laqeydliyini, onların riyakarlığını görəndə bir daha vurğulayırdı ki, bəlkə də, təbiət insanlardan daha anlayışlıdır. *"Bu milləti məndən daha çox sevən neçə adam var?"* - deyən şairi həyatda qarşılaşdığı haqsızlıqlar qəlbən sarsıdırdı. Həqiqətən də, ağrıları, acıları bir neçə misra ilə ifadə etmək böyük sənətkarlıqdan xəbər verir. Ona görə də 67 yaşı tamam olarkən yazdığı "67 yaş" şeirində üzü gülən, amma qəlbi qan ağlayan bir insanın sözlə şəklini çəkirdi. Bu şeirində göstərir ki, ona yaxın olanlar onu başa düşə bilən, amma anlamaq istəməyən insanlar yox, gecələr və gündüzlər, əngin fəzalardır:

*Mənim doğulduğum gün,*
*Günlər uzanmağa başlar.*
*Elə öləcəyəm ki,*
*Gecələr uzanmağa başlayacaq.*
*Və elə öləcəyəm ki,*
*Günlərlə gecələrdən başqa,*
*Kimsə öldüyümü anlamayacaq!*

İnsan həyatı beşikdən qəbrə qədər olan bir mərhələni təşkil edir. Bu qısa mərhələdə insan həmişə harasa tələsir, amma çox vaxt gecikir. Ən mühüm mərhələ isə sevgi və ona çatmaq mərhələsidir. Kim bilir, bəlkə də, sevgiyə vaxtında yox, vaxtından gec çatmaq da bir xoşbəxtlikdir. İnsan çox şeyə geciksə də, ölümə gecikmir. Amma şair təkcə sevgiyə yox, ölümə belə gecikdiyini vurğulayır. Şair insan ömrünün bu mərhələlərini "Bağışla" adlı şeirində aydın təsvir edir:

*Ya vaxtından çox tez gəlirəm,*
*Dünyaya gəldiyim kimi.*
*Ya vaxtından çox gec,*
*Səni bu yaşda sevdiyim kimi.*
*Xoşbəxtliyə həmişə gecikirəm,*
*Həmişə erkən gedirəm*
*bədbəxtliyə.*
*Ya hər şey bitmişdir çoxdan,*
*Ya heç bir şey başlamamışdır.*

*Elə bir vaxtına gəldim ki yaşamın,*
*Ölümə erkən, sevgiyə gec.*
*Yenə gecikmişəm... bağışla,*
*sevgilim*
*Sevgiyə on qalmış, ölümə beş.*

Yuxarıdakı misraları oxuduqca yadıma sevimli xalq şairi Nəriman Həsənzadənin "Nərdivan" şeiri düşür. O, da öz şeirində təxminən belə bir mövzuya toxunmuşdur:

*...Görüşdük pillələrdə,*
*Yolun yarısında biz.*
*O qalxırdı bu dəmdə,*
*Mən enirdim xəbərsiz.*

*...Gərək ya düşməyəydi,*
*Bu görüş heç araya*
*Ya o əvvəl gələydi,*
*Ya mən sonra dünyaya.*

Poeziyada bir çox mövzular vardır ki, bunlar bütün şairlərin yaradıcılığında öz əksini tapıb. Nümunə üçün, "gözəlin vəsfi", "ünvanlı şeirlər", "zəmanədən şikayət" və başqa bu kimi mövzular az qala hər bir şairin yaradıcılığında var. Bu şairlər çox vaxt eyni mövzulardan kənara çıxmırlar. Ona görə də eynitipli əsərlər müəyyən vaxtdan sonra insanı yormağa başlayır. Amma Ə.Nesin yeni mövzularda dəyərli ədəbi əsərlər yazırdı və özündən əvvəlkiləri təkrarlamırdı. Nəsrdə olduğu kimi, nəzmdə də öz orijinallığını qoruyurdu. Bir şeirində də vurğuladığı kimi:

*Hesab et ki heç bir işin yox,*
*düşünürsən*
*Düşün düşünə bildiyincə*
*hərtərəfli.*
*"Amma da düşünür" - deyə*
*çaşsın dünya*
*Sanki, səndən əvvəl düşünən*
*heç olmamış.*
*****
*Zarafatmı edirsən, xülyalarmı*
*qurursan?*
*Elə sonsuz sərhədsiz xülyalar*
*qur ki, övladım.*
*Xülyalarını gözlərilə görsünlər,*
*çaşsınlar*
*"Belə bir yumorist hələ dünyaya*
*gəlmədi" -*
desinlər...

Bütün bu keyfiyyətləri nəzərə alaraq deyə bilərik ki, Ə.Nesin böyük şairdir. Mən böyük şairlərin əsərlərini oxuduqca düşünürəm ki, bu insanlar sanki öncədən nə vaxt vəfat edəcəklərini belə biliblər. Cəfər Cabbarlı vəfat etməmişdən bir gün əvvəl həyat yoldaşı Sonaya demişdir: *"Sonası, bizim nəsil çox yaşamır. Bir də adam bilsə ki, min ildən sonra öləcək, indidən bağrı çatlar, ancaq nə vaxt öləcəyini bilmədiyindən o, ümidlə yaşayır".* Bu söhbətdən bir neçə saat sonra C.Cabbarlı gözlərini həyata əbədi olaraq yummuşdur. Ə.Nesin də belə şəxsiyyətlərdən idi. Ölümündən bir müddət əvvəl sanki nə vaxt öləcəyini bilirmiş kimi öz ölümü haqqında məlumat vermişdi və vəsiyyətini də etmişdi.

Məşhur satira ustası Ə.Nesin 1995-ci il iyul ayının 6-da İzmirdə Çeşmə adlanan yerdə vəfat etdi və özünün şəxsi hesabına açdığı "Əziz Nesin vəqfi"nin həyətində dəfn olundu. Ə.Nesin öz ölməz dühası ilə ölməzlərə qarışdı.

Ə.Nesin insan qəlbinə yol tapan, şeirlərindəki məna dağlar kimi böyük olan bir şairdir. Onun şeirləri yeni-yeni tərcümə olunmağa (dilimizə uyğunlaşdırılımağa) başlasa da, tərcümə edilmiş əsərləri ilə onsuz da oxucuların qəlbində özünə uca bir qala qurmuşdur. Biz əminik ki, Azərbaycan oxucusu onun şeirləri ilə tanış olduqdan sonra Ə.Nesinə olan məhəbbətləri qat-qat artacaqdır. Çünki sevimli şairimiz Ramiz Rövşənin dediyi kimi, "Yaxşı şeir gün işığı kimidir. Onu nə qədər basdırsan da, yenə də üzə çıxacaq!". Ə.Nesinin böyük şəxsiyyəti ilə, bənzərsiz yaradıcılığı ilə dünya tanışdır və tanış olmağa davam edir. Dünya durduqca Ə.Nesinin ölməz əsərləri də qalacaqdır. Çünki ümumbəşəri mövzuları özündə əks etdirən əsərlər əbədi yaşayır.



**Məhəmməd Qaraşov, Filologiya fakültəsinin IV kursunun 402-ci qrup tələbəsi**

# Kitabxanamız zənginləşir

1. İlham Əliyev. "İnkişaf-məqsədimizdir". Doqquzuncu kitab. Bakı, "Azərnəşr", 2012, 408 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan çoxcildliyinin 9-cu cildində 2005-ci il mart-may aylarında olan çıxışları, nitqləri, bəyanatları, müsahibələri, məktubları, məruzələri, müraciətləri, fərmanları və bir sıra görüşləri dərc edilmişdir.

2. İlham Əliyev. "İnkişaf-məqsədimizdir". Onuncu kitab. Bakı, "Azərnəşr", 2012, 408 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan çoxcildliyinin 10-cu cildində 2005-ci il may-iyun aylarında olan çıxışları, nitqləri, bəyanatları, müsahibələri, məktubları, məruzələri, müraciətləri, fərmanları və bir sıra görüşləri toplanmışdır.

3. Əli Rza Xələfli (Əzizli Əlirza Zal oğlu). "Ölməzlik nəğməsi" (ədəbi qeydlər). Bakı, "Vətən" nəşriyyatı, 2013, 352 səh.

Tanınmış şair-publisist Ə.R.Xələflinin "Ölməzlik nəğməsi" əsəri Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin xatirəsinə sonsuz ehtiram və xalq şairi Zəlimxan Yaquba sevgilərlə yazılmışdır.

4. Ə.R.Xələfli "Od" (roman, esselər və poeziya). Bakı, "Nərgiz" nəşriyyatı, 2012, 320 səh.

5. Ə.R.Xələfli "Bu dünyanın mehmanısan" poema. (yenidən işlənilmiş ikinci nəşri). Bakı, "Nərgiz" nəriyyatı, 2012, 288 səh.

Ə.R.Xələflinin "Bu dünyanın mehmanısan" epik-lirik poemasında müasir insanın düşüncə və duyğularının mənzərəsini yaradır. Şirvan mənəvi mühitini yüksək poetik ovqatla tərənnüm edir. Eyni zamanda poemada xalqımızın tarixi faciələrindən, Vətənin bugünkü yaralarından da sonsuz ağrı və həyəcanla bəhs olunur.

6. Ə.R.Xələfli. "Araz ağrısı". (Poemalar və şeirlər). Bakı, "MBM nəşriyyatı", 2012, 384 səh.

Ə.R.Xələflinin "Araz ağrısı" kitabına son illərdə yazdığı poemalar və şeirlər toplanmışdır.

7. Ə.R.Xələfli. "Həyatın dastanı". Ədəbi-fəlsəfi düşüncələr. (Hamlet İsaxanlının "Ziyarət" poemasının motivləri əsasında). Bakı, "Xəzər Universitetinin nəşriyyatı", 2012, 239 səh.

8. Nurlana Əliyeva. "Sovet dövrü Azərbaycan ədəbiyyatı" (1941-1991). Ali və orta ixtisas təhsili məktəbləri üçün dərslik. Bakı, "Elm və təhsil", 2013, 664 səh.

9. Allahmanlı M. " Çağdaş ədəbi proses". (Problemlər, mülahizələr). Bakı, ADPU-nun nəşriyyatı, 2013, 100 səh.

Kitabda müəllifin son illərdə ədəbi prosesin müxtəlif problemləri ilə bağlı yazılmış araşdırmaları toplanmışdır.

10. "Azərbaycan dilinin müxtəsər orfoepiya lüğəti". Bakı, ADPU, 2013.

Lüğət ali məktəb tələbələri və magistrantlar üçün nəzərdə tutulmuşdur.

11. Əzimli Q.E. "İnkişaf, yaş və pedaqoji psixologiyanın müasir problemləri" (Ali məktəblər üçün dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2013, 528 səh.

Dərs vəsaitində "İnkişaf, yaş və pedaqoji psixologiya"proqramına uyğun olaraq inkişaf və yaş psixologiyasının mövzusu, nəzəri problemləri, başqa elmlərlə əlaqəsi kimi məsələlər şərh edilir.

12. Əliyev A., Əsgərova M. "Qafqazın təbii şəraiti", onun eroziya prosesinə təsiri, fiziki- coğrafi rayonlaşması və ekoloji problemləri". Bakı, ADPU-nun nəşriyyatı, 2012, 135 səh.

13. Məstəliyev V.Y. "İnteqral çevirmələri və onun tətbiqləri". Bakı, ADPU-nun nəşriyyatı, 2013, 195 səh.

Vəsaitdə inteqral çevirmələrlə bağlı bəzi nəzəri məlumatlar qısa şəkildə şərh olunmaqla yanaşı, onların doğruluğu misallarla göstərilmiş və müstəqil həll etmək üçün hər bölmənin sonunda tapşırıqlar verilmişdir.

14. "Xocalı soyqırımı-20: Biblioqrafiya". Tərtib edəni: M.Məmmədova; ixt.red. və burax. məsul K.Tahirov; red. G.Səfərəliyeva; Mirzə Fətəli Axundzadə adına Azərbaycan Milli Kitabxanası. Bakı, 2012, 313 səh.

15. Eyvazov E.Ə. "Bərk cisimlər fizikası". Dərs vəsaiti. Bakı, "Təhsil" NPM, 2012, 450 səh.

16. Nəsirov V.İ. "Optika" (nəzəri materiallar, test tapşırıqları). Bakı, ADPU-nun nəşriyyatı, 2012, 349 səh.

Təqdim olunan vəsait pedaqoji universitetlərin fizika fakültələrinin bakalavriat pilləsi üçün nəzərdə tutulmuşdur və mövcud proqram əsasında qələmə alınmışdır.

17. "Azərbaycanın müdafiə silahları". Milli Azərbaycan Tarixi Muzeyinin kolleksiyasından. Bakı, Milli Azərbaycan Tarixi Muzeyi, 2012, 79 səh.

18. Baxşəliyev Ə. "Psixologiya tarixi oçerkləri". Bakı, "Elm", 2012, 513 səh.

Kitabda Azərbaycanda elmi psixologiyanın formalaşmasının ilkin qaynaqları, bu elmin inkişaf edib formalaşmasında milli-mənəvi dəyərlərin rolu konkret faktlarla şərh olunur.

19. Muxtarova S. "Son döyüşə gedən yol". Bakı, "Nərgiz nəşriyyatı" 2012, 220 səh.

20. Rüstəmova A. "İctimai inkişaf və dil". Bakı, "Təknur", 2012, 144 səh.

Monoqrafiyada ictimai inkişafda dilin rolu məsələləri araşdırılır. Modernləşmə, kommunikasiya, milli identikliyin formalaşmasında dil amili problemləri nəzərdən keçirilir.

21. Cəlilov K.Ə., Məstəliyev V.Y., Əhmədov S.Z. "İnteqral tənliklər". Dərs vəsaiti. Bakı, ADPU-nun nəşriyyatı, 2013, 111 səh.

Vəsait inteqral tənliklər fənninin bəzi əsas bölmələrini əhatə edir. Hər bir bölməyə aid əsas nəzəri məlumatlar qısa şəkildə izah edilməklə yanaşı, bir neçə tipik çalışmaların həlli göstərilmiş, müstəqil həll etmək üçün misallar və test tapşırıqları verilmişdir.

22. Balayeva G. "İbtidai təhsilin məzmununun nəzəri-pedaqoji problemləri". Bakı, "Elm və Təhsil", 2012, 152 səh.

Kitabda ibtidai təhsilin məzmununun nəzəri problemləri araşdırılır, ibtidai təhsilin məzmununun prinsipləri, funksiyaları, struktur məsələləri təhlil edilir.

23. Adıgözəlov A.S. "Orta məktəbdə riyaziyyatın tədrisi metodikası (ümumi metodika)". Pedaqoji Universitetin tələbələri üçün dərs vəsaiti. ADPU, 2009, 250 səh.

Dərs vəsaitində ölkəmizdə həyata keçirilən yeni təhsil islahatları nəzərə alınmaqla sistemli analiz və fəaliyyətli yanaşma əsasında riyaziyyat təliminin ümumi məsələləri şərh olunmuşdur.

24. Əliyev Ə.H., Əliyeva F.Ə., Mədətova V.M. "İnsan və heyvan fiziologiyası". I hissə. (Bakalavr hazırlığı üçün dərslik). Bakı, "Bakı Universitetinin nəşriyyatı", 2012, 416 səh.

Bakalavr pilləsində oxuyan tələbələr üçün biologiyanın əsas bölmələrindən biri olan "İnsan və heyvan fiziologiyası" üzrə nəzərdə tutulan mühazirə materialları ikicildlik dərslik kimi təqdim edilir.

25. Aslanov L.Ə. "Yenə Vətən yaxşı". (tarixi sənədli-publisistik povest). Bakı, "Oğuz Eli", 2013, 215 səh.

İkinci Dünya müharibəsində alman faşizmi ilə mübarizədə Azərbaycan xalqının oğul və qızları böyük əzmkarlıqla iştirak etmiş, qəhrəmanlıq nümunələri göstərmişlər. Onlardan biri Fransa Müqavimət Hərəkatının iştirakçısı, faşizmin məhv olmasında göstərdiyi şücaətə görə "Fransanın Milli Qəhrəmanı" adına layiq görülmüş, bu ölkənin "Fəxri legion ordeni" ilə təltif edilmiş, Fransanın "Hərbi medalına" layiq görülmüş yeganə SSRİ vətəndaşı Əhmədiyyə Cəbrayılovdur.

Kitabda qəhrəmanın həyat və döyüş yolundan bəhs olunur.

26. Zeynalov F.İ., Məmmədov İ.E. "Rəsm". Dərslik. Pedaqoji universitet və institutlar üçün. Bakı, ADPU, 2012, 217 səh.

Kitabda rəsm fənninin nəzəri və praktik tərəflərinə toxunulmuş, rəsmin əsas nəzəri bilikləri açıqlanmış, praktik tapşırıqlarda rəsmin düzgün çəkilməsi üçün mövcud olan metodik qaydalar izah olunmuşdur.

27. Abbasova L.M., Əliyeva M.Ə. "Konsertmeyster sinfi üzrə dərs vəsaiti". Bakı, ADPU-nun nəşriyyatı, 2012, 132 səh.

28. Baxşəliyev Ə.T., Əliyeva N.H. "Praktk psixoloqun stolüstü kitabı". Bakı, ADPU, 2013, 128 səh.

29. Mamedov M. "Aküiznəə politika üarizma v Azerbaydjane v XIX v". Baku, «Ziə», 2012, 208 str.

30. Dulaeva Z. i dr. «Oni srajalisğ za Belarusğ » ( Uçastie azerbaydjanüev v osvobojdenii Belarusi). Baku, "Ziə", 2012, 208 str.

Kniqa, rassçitannaə na şirokuö çitatelğskuö auditoriö, posvəşena uçastiö sınov Azerbaydjana v osvobojdenii belorusskoy zemli ot nemeüko-faşistskix voysk vo vremə Vtoroy Mirovoy Voynı.

31. Həsənli C.P. "Sovet dövründə Azərbaycanın xarici siyasəti (1920-1939)". Bakı, "Adiloğlu" nəşriyyatı, 2012, 656 səh.

"Azərbaycan Respublikasının diplomatiya tarixi" seriyasından hazırlanan ikinci kitab ötən əsrin 20-30-cu illərində Azərbaycanın xarici siyasətini əhatə edir. Kitabda 1920-1939-cu illərdə Azərbaycan diplomatiyasının keçdiyi çətin və maraqlı yol araşdırılmışdır.

32. "Azərbaycan tarixinin öyrənilməsində muzeylərin rolu". II Respublika Elmi Konfransının materialları. Bakı, "Ziya", 2012, 164 səh.

33. "Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin 1972-2011-ci illərdə nəşr olunmuş əsərlərinin biblioqrafiyası". III hissə. Humanitar elmlər. Bakı, ADPU-nun nəşriyyatı, 2013, 578 səh.

Göstəricidə humanitar elmlərə aid monoqrafiya, dərslik, dərs vəsaitləri, metodik göstərişlər və s. öz əksini tapmaqla yanaşı, dəqiq elmlərə aid proqram, metodiki göstəriş, avtoreferat və s. çap olunmuşdur.

34. "ADPU-nun professor müəllim heyətinin 1972-2011-ci illərdə nəşr olunmuş əsərlərinin biblioqrafiyası". IV hissə. Dəqiq, təbiət və tibb elmləri. Bakı, ADPU-nun nəşriyyatı, 2013, 534 səh.

Universitetin 90 illik yubileyinə həsr olunmuş göstəricinin bu sayına dəqiq, təbiət və tibb elmlərinə dair azərbaycan dilində yazılmış və çap olunmuş əsərlər daxil edilmişdir.

35. Orucov H. "Azərbaycanda din: ən qədim dövrdən bugünədək". Bakı, "İdrak-İB", 2012, 388 səh., şəkilli.

Əsər Azərbaycan dinşünaslığında dinlərin tarixini bütövlükdə özündə əks etdirən ilk fundamental monoqrafiyadır. Monoqrafiyaya tarixi-dini məbədlər barədə məlumatlar və fotolar daxil edilmişdir.

36. Çobanov M.N. "Azərbaycan dilinin tətbiqi sahəsinin müasir problemləri". Bakı, "Apostrof" Çap Evi, 2013, 169 səh.

Kitabda Azərbaycan dilinin tətbiqi sahəsinin, o cümlədən, şifahi və yazılı ədəbi dilimizin müasir problemləri öz əksini tapmışdır.

37. "Şirvanın bədii metalı". Bakı, Milli Azərbaycan Tarixi Muzeyi, 2012, 101 səh.

Kitabda arxeoloji qazıntı yerləri və nümunələri haqqında məlumat verilmişdir.

38. "Mirzə Fətəli Axundzadə-200: biblioqrafiya". Bakı, "Zərdabi LTD" MMC Nəşriyyat-Poliqrafiya müəssisəsi, 2012, 359 səh.

Vəsaitdə ədibin əsərləri tam şəkildə öz əksini tapmış, haqqında olan və 1957-ci ildən bu günə kimi dövrü əhatə edən materiallar toplanmışdır.

39. "Mirzə Fətəli Axundzadə-200: Kataloq". Bakı, "Ziya" NPM, 2012, 56 səh.

40. "Azərbaycan xalçası: biblioqrafiya". Bakı, "Zərdabi LTD" MMC Nəşriyyat-Poliqrafiya müəssisəsi, 2012, 438 səh.

Göstəriciyə Azərbaycan xalça sənətinə aid kitablar haqqında məlumat verilmiş, həmin kitablarda çap olunmuş məqalələr, qəzet və jurnal materialları daxil edilmişdir. Vəsaitdə Azərbaycanın bir çox görkəmli xalçaçı alim və tədqiqatçılarının əsərləri, onlar haqqında məqalələr ayrıca bölmədə təqdim edilmişdir.

41. "Mirzə Ələkbər Sabir-150: biblioqrafiya". Bakı, "Zərdabi LTD"MMC Nəşriyyat-Poliqrafiya müəssisəsi, 2012, 382 səh.

Vəsaitdə şairin 1903-2012-ci illər nəşr olunan əsərlərinin, həyat və fəaliyyəti haqqında yazılan materialların biblioqrafik göstəriciləri haqqında məlumat verilmişdir. Şairin yubileyi ərəfəsində hazırlanan bu elmi- köməkçi göstərici üçün materiallar yenidən işlənmiş, əlavələr edilərək daha da təkmilləşdirilmişdir.

**Fəridə Məmmədova,**
**Elmi kitabxananın**
**Məlumat-biblioqrafiya**
**şöbəsinin böyük biblioqrafı**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Filologiya fakültəsinin dekan müavini, dosent Pəri Paşayevaya əzizi
**Nəriman Quliyevin**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ekologiya kafedrasının müdiri, dosent Yavər Əliyevə əzizləri
**Məlik Quliyevin və**
**Ziba Kərimovanın**
vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti Firudin Cümşüdlüyə, qardaşı
**Vaqifin**
vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Xarici dillər kafedrasının baş müəllimi Məsmə İsmayılovaya atası
**Əliyulla İsmayılovun**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elektroradiotexnika kafedrasının baş müəllimi Ədalət Quliyevə atası
**Firudin Quliyevin**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Bədən tərbiyəsi kafedrasının baş müəllimi
**Fərman Məmmədovun**
vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının əməkdaşı
**Nüşabə Mukimovanın**
vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3901
Sayı: 1500
Çapa imzalanıb: 30.09.2013-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.